كلمة التوحيد

# لا إله إلا الله

فضائلها ومدلولها وشروطها ونواقضها

ABDURAZZAQ IBN ABDULMUHSIN AL-BƏDR

# TÖVHİD KƏLİMƏSİ

# LƏ İLƏHƏ İLLƏLLAH

## FƏZİLƏTLƏRİ, MƏNASI, ŞƏRTLƏRİ VƏ ONU POZAN AMİLLƏR



Lə iləhə illəllah_Tövhid kəliməsi

Onun fəzilətləri, mənası, şərtləri və onu pozan amillər

Müəllif : Abdurrəzzaq bin Abdulmuhsin əl-Bədr

Tərcümə : Azər Mustafa

Bismilləhir-Rahmənir-Rahim (Mərhəmətli və Rəhmli olan Allahın adı ilə)

Müqəddimə

Həmd Allaha məxsusdur. Şahidlik edirəm ki, şəriki olmayan Allahdan başqa ibadətə layiq heç bir haqq ilah (məbud) yoxdur və şahidlik edirəm ki, Muhəmməd onun qulu və elçisidir-onun üzərinə Allahın çoxlu xeyir duası və salamı olsun.

Və sonra...

Bu risalə müxtəsər və faydalı şəkildə ən xeyirli, ən üstün və ən uca olan Lə iləhə illəllah tövhid kəliməsinin fəzilətlərini mənasını, şərtlərini və onu pozan amilləri əhatə edir.Və onun əsli “ Dua və zikrlərin anlaşılması” kitabımdan çıxarılışdır, ümumi xeyrini və ifadə tərzinin asanlığını nəzərə alaraq bəzi möhtərəm insanlar onun müstəqil şəkildə kitab olmasını istədilər. Allahdan bu kitabın bərəkətini çoxaltmasını və qullarından istədiyinə hidayət üçün səbəb etməsini, bizim hamımızı özünün nemət verdiyi peyğəmbərlər, sadiqlər (doğru olanlar), şəhidlər və salehlərin doğru yoluna yönəltməsini istəyirəm, onlar necə gözəl yoldaşdır.Allah bizə kifayətdir, O necə də gözəl yardımçı və himayə edəndir. Onun salam və xeyir-duası qulu və elçisi Muhəmmədə, onun ailəsinə və bütün səhabələrinin üzərinə olsun.

Yazdı : Abdurrəzzaq bin Abdulmuhsin əl-Bədr

## Lə iləhə illəllah – tövhid kəliməsinin fəzilətləri

Həqiqətən də bu ali kəlimənin böyük fəzilətləri, yüksək dəyərləri, çoxsaylı üstünlükləri vardır. Heç kəs onu dərinliklərini haqqı ilə araşdıra bilməz, o kəlimələrin ən fəzilətli, ən uca və ən şərəflisidir. Məxluqat onun üçün yaranmışdır, elçilər buna görə göndərilmişdir, kitablar onun üçün endirilmişdir. Bu kəliməyə görə insanlar mömin və kafir, Cənnət əhlinin xoşbəxtləri və Cəhənnəm əhlinin bədbəxtləri - deyə ayrılmışlar. O qırılmaz ipdir, o təqva kəliməsidir, o İslamın ən əzəmətli ərkanı imanının ən əhəmiyyətli şöbəsidir. O Cənnətə doğru qurtuluş yolu və Cəhənnəmdən xilas olmaqdır. O şəhadət kəliməsidir, səadət yurdunun açarıdır, dinin əsli, əsası və onun başlanğıcıdır.Bu kəlimənin fəzilətləri və dindəki məkanı onu vəsf edənlərin və onun mənasını dərk edənlərin bilgisindən daha ucadadır.

﴿ شَهِدَ اللَّهُ أَنَّهُ لَا إِلَهَ إِلَّا هُوَ وَالْمَلَائِكَةُ وَأُولُو الْعِلْمِ قَائِمًا بِالْقِسْطِ لَا إِلَهَ إِلَّا هُوَ الْعَزِيزُ الْحَكِيمُ ﴾

“Allah Özündən başqa ibadətə layiq olan məbudun olmadığına şahidlik etdi, mələklər və elm sahibləri də boyun əyərək şahidlik etdilər. O qüvvət, hikmət sahibindən başqa ibadətə layiq heç bir ilah yoxdur.” (Ali İmran 18)

Qurani-Kərimdə bu kəlimənin fəziləti barədə varid olanlara görə Allah təbərakə və təalə onu Peyğəmbərlərin dəvətinin mənası və çağırışlarının əsası etmişdir,Allah təalə deyir : ﴿ وَمَا أَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ إِلَّا نُوحِي إِلَيْهِ أَنَّهُ لَا إِلَهَ إِلَّا أَنَا فَاعْبُدُونِ ﴾

“Səndən əvvəl elə bir elçi göndərməmişik ki, ona: "Məndən başqa heç bir məbud yoxdur, Mənə ibadət edin!"– deyə vəhy etməyək.” ( Ənbiya 25) Digər ayədə isə :

﴿ وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ أُمَّةٍ رَسُولًا أَنِ اعْبُدُوا اللَّهَ وَاجْتَنِبُوا الطَّاغُوتَ ﴾

“Biz hər ümmətə: "Allaha ibadət edin, tağutdan uzaq olun"– deyə,elçi göndərdik.” (Nəhl 36) və Allah Nəhl surəsinin əvvəlində demişdir :

﴿ يُنَزِّلُ الْمَلَائِكَةَ بِالرُّوحِ مِنْ أَمْرِهِ عَلَى مَنْ يَشَاءُ مِنْ عِبَادِهِ أَنْ أَنْذِرُوا أَنَّهُ لَا إِلَهَ إِلَّا أَنَا فَاتَّقُونِ ﴾

“Allah Öz hökmü ilə qullarından istədiyi kimsəyə mələkləri vəhylə göndərib buyurur: "Qullarımı qorxudub xəbərdar edin ki, Məndən başqa ibadətə layiq olan məbud yoxdur, elə isə Məndən qorxun!"“ (Nəhl 2). Surədəki bu ayələr Allahın qullara verdiyi ilk nemətlərin bildirilməsidir.Bu dəlalət edir ki, bu məsələdə müvəffəqiyyət Allahın qullarına bəxş etdiyi ən böyük nemətdir.

﴿ أَلَمْ تَرَوْا أَنَّ اللَّهَ سَخَّرَ لَكُمْ مَا فِي السَّمَاوَاتِ وَمَا فِي الْأَرْضِ وَأَسْبَغَ عَلَيْكُمْ نِعَمَهُ ظَاهِرَةً وَبَاطِنَةً ﴾

”Məgər Allahın göylərdə və yerdə olanları sizə ram etdiyini, Özünün aşkar və gizli nemətlərini sizə bol-bol verdiyini görmürsünüzmü?”(Loğman 20)

Mucahid-*rahiməhullah-*[1] ayəni təfsir edərkən dedi : Yəni Lə iləhə illəllah.[2]

Sufyən ibn Uyeynə-*rahiməhullah-* demişdir : Allahın öz qullarından bir quluna Lə iləhə illəllahı öyrətməsindən daha böyük bir neməti yoxdur.[3]

Və onun fəzilətlərindən biri də - Allahın onu Quranda gözəl söz kimi qeyd etməsidir.Allah demişdir :

﴿ أَلَمْ تَرَ كَيْفَ ضَرَبَ اللَّهُ مَثَلًا كَلِمَةً طَيِّبَةً كَشَجَرَةٍ طَيِّبَةٍ أَصْلُهَا ثَابِتٌ وَفَرْعُهَا فِي السَّمَاءِ (24)تُؤْتِي أُكُلَهَا كُلَّ حِينٍ بِإِذْنِ رَبِّهَا وَيَضْرِبُ اللَّهُ الْأَمْثَالَ لِلنَّاسِ لَعَلَّهُمْ يَتَذَكَّرُونَ(25) ﴾

24.Allahın necə məsəl çəkdiyini görmürsənmi? Gözəl söz (lə iləhə illəllah) kökü yerdə möhkəm olan, budaqları isə göyə yüksələn gözəl bir ağac kimidir.25 O ağac Rəbbinin izni ilə öz bəhrəsini hər zaman verir. Allah insanlar üçün misallar çəkir ki, bəlkə, düşünüb ibrət alsınlar. (İbrahim 24-25)

Və o sabit sözdür :

﴿ يُثَبِّتُ اللَّهُ الَّذِينَ آمَنُوا بِالْقَوْلِ الثَّابِتِ فِي الْحَيَاةِ الدُّنْيَا وَفِي الْآخِرَةِ وَيُضِلُّ اللَّهُ الظَّالِمِينَ وَيَفْعَلُ اللَّهُ مَا يَشَاءُ﴾

“Allah iman gətirənləri dünya həyatında da, axirətdə də möhkəm sözlə sabit saxlayar. Allah zalımları sapdırar. Allah istədiyini edər.” (İbrahim 27)

Və o əhddir : ﴿ لَا يَمْلِكُونَ الشَّفَاعَةَ إِلَّا مَنِ اتَّخَذَ عِنْدَ الرَّحْمَنِ عَهْدًا ﴾

“Mərhəmətli Allahdan əhd almış kəslərdən başqaları şəfaət etməyə qadir olmazlar.”(Məryəm 87)

İbn Abbasdan-*radıyallahu anhu-*[4] rəvayət olunur ki, o demişdir : Əhd - Lə iləhə illəllah şəhadətidir, güc və qüvvətin Allaha məxsus olduğunu qəbul etməkdir, bu bütün təqvanın başlanğıcıdır.[5]

Və onun fəzilətlərindən – o qırılmaz ipdir, kim ondan möhkəm tutsa xilas olar, kim ondan tutunmasa həlak olar.Allah demişdir :

﴿ فَمَنْ يَكْفُرْ بِالطَّاغُوتِ وَيُؤْمِنْ بِاللَّهِ فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقَى﴾

---

[1] Rahiməhullah-Allah ona rəhmət etsin
[2] İbn Cərir “Təfsir”ində rəvayət etmişdir (11/78)
[3] İbn Rəcəb “Kəlimətul-İxləs” (səh. 53)
[4] Radıyallahu anhu-Allah ondan razı olsun
[5] Tabərani “Dua” (3/1518)

“Hər kəs Tağutu (Allahdan başqa ibadət olunanları) inkar edib Allaha iman gətirsə, o, artıq qırılmayan möhkəm bir ipdən (dəstəkdən) yapışmış olar.” (Bəqərə 256) və demişdir : ﴿ وَمَنْ يُسْلِمْ وَجْهَهُ إِلَى اللَّهِ وَهُوَ مُحْسِنٌ فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقَى ﴾

Kim yaxşı əməl sahibi olub özünü (səmimi-qəlbdən) Allaha təslim edərsə, o artıq ən möhkəm ipdən (dəstəkdən) yapışmış olur.(Loğman 22)

Və onun fəzilətlərindən İbrahim Xəlilin*-aleyhisələm-*[6] onu qövmünün dönməsi ümidi ilə daimi qalacaq bir kəlimə etməsidir :

﴿وَإِذْ قَالَ إِبْرَاهِيمُ لِأَبِيهِ وَقَوْمِهِ إِنَّنِي بَرَاءٌ مِمَّا تَعْبُدُونَ (26) إِلَّا الَّذِي فَطَرَنِي فَإِنَّهُ سَيَهْدِينِ (27) وَجَعَلَهَا كَلِمَةً بَاقِيَةً فِي عَقِبِهِ لَعَلَّهُمْ يَرْجِعُونَ (28) ﴾

“26. Bir zaman İbrahim öz atasına və qövmünə demişdi: "Mən sizin ibadət etdiklərinizdən uzağam.27. Yalnız məni yaradandan başqa! Şübhəsiz ki, O məni doğru yola yönəldəcəkdir” 28. O bunu ("lə ilahə illəllah" kəlməsini) öz nəsli arasında daimi qalacaq bir kəlmə etdi ki, bəlkə doğru yola qayıtsınlar. (Zuxruf 26-28)

O təqva kəliməsidir ki, Allah Rəsulunun*– sallalahu aleyhi vəssəlləm –*[7] səhabələrini bununla mükəlləf etmişdir və buna ən çox riayət edən və bu sözün əhli olan da onlardır, Allah demişdir :

﴿إِذْ جَعَلَ الَّذِينَ كَفَرُوا فِي قُلُوبِهِمُ الْحَمِيَّةَ حَمِيَّةَ الْجَاهِلِيَّةِ فَأَنْزَلَ اللَّهُ سَكِينَتَهُ عَلَى رَسُولِهِ وَعَلَى الْمُؤْمِنِينَ وَأَلْزَمَهُمْ كَلِمَةَ التَّقْوَى وَكَانُوا أَحَقَّ بِهَا وَأَهْلَهَا وَكَانَ اللَّهُ بِكُلِّ شَيْءٍ عَلِيمًا ﴾

“Kafirlər öz ürəklərində Cahiliyyət təkəbbürü təəssübünə qapıldıqları (Hüdeybiyyə sazişinə “bismillahir-rəhmanir-rəhim”, “Muhəmmədun rəsulullah” sözlərini yazmaqdan imtina etdikləri, hicrətin altıncı ilində Muhəmməd*– sallalahu aleyhi vəssəlləm –*Məkkəyə daxil olmasına razılıq vermədikləri) zaman Allah Peyğəmbərinə*– sallalahu aleyhi vəssəlləm –*və möminlərə öz dərgahından arxayınlıq (qəlb rahatlığı, mənəvi möhkəmlik) göndərmiş və onlara təqva gəlməsini (la ilahə illallah, Muhəmmədun rəsulullah” sözünü) xas etmişdi. Onların bu sözə (Məkkə müşriklərindən) daha çox haqqı var idi və ona layiq idilər. Allah hər şeyi biləndir!”(Fəth 26)

Əbu İshaq əs-Səbiiyy Ömər ibn Meymunədən rəvayət edir : “İnsanlar Lə iləhə illəllahdan daha fəzilətli bir şey söyləməyiblər, Sə`d ibn İyad*-rahiməhullah-* isə demişdir : Ey Əbu Abdullah, sən bilirsənmi ki, o nədir ? Vallahi ki, o təqva kəliməsidir ki, Allah onu Rəsulunun səhabələrinə vacib etmişdir, buna ən çox riayət edən və bu sözün əhli olan da onlardır.[8]

Həmçinin bu kəlimənin fəzilətlərindən : Doğru sözün ən üstünü və əsasıdır.Allah təalə demişdir :

﴿ يَوْمَ يَقُومُ الرُّوحُ وَالْمَلَائِكَةُ صَفًّا لَا يَتَكَلَّمُونَ إِلَّا مَنْ أَذِنَ لَهُ الرَّحْمَنُ وَقَالَ صَوَابًا ﴾

---

[6] Aleyhisələm-Allahın salamı onun üzərinə olsun

[7] Sallallahu aleyhi vəsəlləm-Allahın xeyir duası və salamı onun üzərinə olsun

[8] Tabərani “Dua” (3/1533)

“Ruhun (Cəbrailin) və mələklərin səf-səf duracağı gün Rahmənin izin verdiyi kimsələrdən başqa heç kəs danışmayacaq, danışan da doğrunu deyəcəkdir!”(Nəbə 38) Əli ibn Əbi Talhədən rəvayət olunur ki, İbn Abbas*-radıyallahu anhu-* Allahın – “Rahmənin izin verdiyi kimsələrdən başqa heç kəs danışmayacaq, danışan da doğrunu deyəcəkdir! – ayəsi haqqında demişdir – Rəbb azzə və cəllə yalnız Lə iləhə illəllah şəhadətinə icazə verər, o da doğru sözün ən üstünüdür.[9]

Və İkrimə*-rahiməhullah* demişdir : Doğru – yəni Lə iləhə illəllah [10]

Və onun fəzilətlərindən - istənilən haqq dəvətdir, haqq çağırışdır, Allahın bu kəlamında bildirildiyi üzrə :

﴿لَهُ دَعْوَةُ الْحَقِّ وَالَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ لَا يَسْتَجِيبُونَ لَهُمْ بِشَيْءٍ إِلَّا كَبَاسِطِ كَفَّيْهِ إِلَى الْمَاءِ لِيَبْلُغَ فَاهُ وَمَا هُوَ بِبَالِغِهِ وَمَا دُعَاءُ الْكَافِرِينَ إِلَّا فِي ضَلَالٍ﴾

“14.Haqq çağırış yalnız Onadır. (Müşriklərin) Ondan başqa çağırdıqları isə, onlara heç bir şeylə cavab vermirlər. Onlar ağzına (su) çatsın deyə (uzaqdan) iki ovcunu suya açan kimsəyə bənzəyirlər. Halbuki (o kimsə suyu ovuclayıb içməyincə) su (onun) ağzına çatan deyildir. Doğrusu, kafirlərin duası azğınlıqdan başqa bir şey deyildir.” ( Ra`d 14).

Bu fəzilətlərdən – O Əhli-İslamın üzərində cəm ounduqları həqiqi birlikdir. Ona görə dostluq və düşmənçilik edirlər, ona görə sevib ona görə nifrət edirlər. Onun səbəbindən müsəlman toplumları bir tək bədən kimi, sıx və yığcam bina kimi olurlar, bir-birlərinə dəstək olurlar.

Alləmə Şeyx Muhəmməd Əmin əş-Şinqiti*-rahiməhullah* özünün “Ədvaul-Bəyan” kitabında demişdir: Xülasə olaraq : Təfriqə və ixtilafı aradan qaldıran həqiqi birlik və əlaqə Lə iləhə illəllah-la olan birlikdir. Görmürsənmi ki, bu rabitə və əlaqə islam toplumunun hamısını bir bədən kimi birləşdirir və onu bir-birinə dəstək verən sıx binalar kimi edir. Aralarında ixtilaf olmasına baxmayaraq Ərşi daşıyan və onun ətrafında olan mələklərin qəlblərini yer üzündəki Adəm övladına tərəf yönəldir ?!, Allah təalə deyir :

﴿الَّذِينَ يَحْمِلُونَ الْعَرْشَ وَمَنْ حَوْلَهُ يُسَبِّحُونَ بِحَمْدِ رَبِّهِمْ وَيُؤْمِنُونَ بِهِ وَيَسْتَغْفِرُونَ لِلَّذِينَ آمَنُوا رَبَّنَا وَسِعْتَ كُلَّ شَيْءٍ رَحْمَةً وَعِلْمًا فَاغْفِرْ لِلَّذِينَ تَابُوا وَاتَّبَعُوا سَبِيلَكَ وَقِهِمْ عَذَابَ الْجَحِيمِ (7) رَبَّنَا وَأَدْخِلْهُمْ جَنَّاتِ عَدْنٍ الَّتِي وَعَدْتَهُمْ وَمَنْ صَلَحَ مِنْ آبَائِهِمْ وَأَزْوَاجِهِمْ وَذُرِّيَّاتِهِمْ إِنَّكَ أَنْتَ الْعَزِيزُ الْحَكِيمُ (8) وَقِهِمُ السَّيِّئَاتِ وَمَنْ تَقِ السَّيِّئَاتِ يَوْمَئِذٍ فَقَدْ رَحِمْتَهُ وَذَلِكَ هُوَ الْفَوْزُ الْعَظِيمُ (9)﴾

“7. Ərşi daşıyanlar və onun ətrafında olanlar (mələklər) öz Rəbbini həmd-səna ilə təqdis edir, Ona (qəlbən) inanır və möminlərin bağışlanmasını diləyərək belə deyirlər : Ey Rəbbimiz! Sənin rəhmin və elmin hər şeyi ehtiva etmişdir. Artıq tövbə edib Sənin yolunla gedənləri bağışla, onları cəhənnəm əzabından qoru! 8.Ey Rəbbimiz! Onları da, atalarından, zövcələrindən və nəsillərindən əməlisaleh olanları da özlərinə vəd buyurduğun Ədn cənətlərinə daxil et. Şübhəsiz ki,Sən

[9] Tabərani “Dua” (3/1520)
[10] Tabərani “Dua” (3/1520)

yenilməz qüvvət, hikmət sahibisən! 9.Onları pisliklərdən qoru. O gün (qiyamət günü) pisliklərdən kimi qorusan, şübhəsiz ki, ona rəhm etmiş olursan. Ən böyük qurtuluş (uğur) budur!” (Mumin 7-9)

Artıq burada Allah təalə işarə etmişdir ki, Ərşi daşıyan və onun ətrafında olan mələklərlə yer üzərindəki Adəm övladlarının arasındakı əlaqə yalnız Allaha imana görədir. Hətta bu əlaqə o dərəcədədir ki, onlar Allaha insanlar üçün bu saleh dua ilə yalvarırlar.

Daha sonra şeyx sözünə davam edərək : Xülasə olaraq : Müsəlmanlar arasında ixtilaf yoxdur ki, yer üzərindəki insanların arasındakı birlik və yer və səma əhlinin arasındakı birlik bu – Lə iləhə illəllah kəliməsi illədir, bundan başqa şüarlarla birləşmək isə qəti olaraq mümkün deyil.[11]

Həmçinin bu kəlimənin fəzilətlərindən : O yaxşılıqların ən üstünüdür, necə ki Allah təalə buyurur :

﴿ مَنْ جَاءَ بِالْحَسَنَةِ فَلَهُ خَيْرٌ مِنْهَا وَهُمْ مِنْ فَزَعٍ يَوْمَئِذٍ آمِنُونَ ﴾

“Hər kəs (Rəbbinin hüzuruna) yaxşı əməllə (tövhid kəlməsi ilə, səmimi-qəlbdən imanla) gəlsə, onu (bu əməlin) müqabilində daha yaxşı bir mükafat (Cənnət) gözləyir. Beləlşəri o gün (qiyamət günü) dəhşətli qorxudan da əmin olarlar.”( Nəml 89)

İbn Məsud, İbn Abbas, Əbu Hurreyrə*-radıyallahu anhum-* və digərlərindən varid olduğu üzrə : Bu ayədə “yaxşılıq” sözündə məqsəd Lə iləhə illəllahdır.[12]Və İkrimə*-rahiməhullah-* Allahın bu ayəsindəki “yaxşılıq” sözü haqqında demişdir : Lə iləhə illəllah sözüdür və ondan o kəsə xeyirlisi vardır,(yəni xeyir müqabilində ona xeyir veriləcək, daha xeyirlisi deyil ) çünki Lə iləhə illəllahdan daha xeyirli bir şey yoxdur.[13]

Və “Müsnəd” və qeyri kitablarda Əbu Zərdən*-radıyallahu anhu-* sabit olduğu üzrə - Dedim : Ey Allahın Rəsulu, mənə elə bir əməl öyrət ki, məni Cənnətə yaxınlaşdırsın və Cəhənnəmdən uzaqlaşdırsın.Dedi : “ Bir günah etdikdə dərhal xeyirli bir əməl et, çünki o günahın on mislidir.” Dedim : Ey Allahın Rəsulu bəs Lə iləhə illəllah xeyirli əməl deyilmi ? Dedi : “Bəli, o ən xeyirli əməldir”[14]



[11] “Ədvəul-bəyən” (3/447,448)
[12] Təbərani “Dua” (3/1497,1498)
[13] İbnul-Bənnə “Fədlit-təhlil və savabihil-cəzil” (səh.74)
[14] “Müsnəd”(5/169). Təbərani “Dua” (1498) ləfz də ona məxsusdur

## Sünnədən bu kəlimənin digər fəzilətləri

Əvvəlki başlıqda Qurani-Kərimdə varid olduğu üzrə tövhid kəliməsi – Lə iləhə illəllah-ın fəzilətləri haqqında danışdıq.Dedik ki, bu əzəmətli kəliməyə görə yer və göylər qurulmuş, bütün məxluqat yaradılmış, onunla elçilər göndərilmiş, kitablar endirilmiş (yəni səmavi kitablar nəzərdə tutulur – Quran, İncil, Tövrat, Zəbur və s.- tərc.), şəriətlər qoyulmuş, ona görə tərəzilər qurular və dəftərlər açılar, Cənnət və Cəhənnəm bazarı açılar, məxluqat möminlər və kafirlər, xeyirlilər və günahkarlar deyə 2 qismə bölünər. O yaradılışın və işin, mükafat və cəzanın əsasıdır. O elə bir haqdır ki, İslam milləti və qiblə ona görə təyin olundu, Qiyamət günü əvəlkilər və sonuncular ondan soruşulacaq.Qulun ayağı yerindən tərpənməyəcək ta ki, o iki məsələ haqqında soruşulmayana qədər : Siz nəyə ibadət edirdiniz ? Elçilərin çağırışına necə cavab verdiniz ?

Birinciyə cavab : Lə iləhə illəllah – tövhid kəliməsini elmlə bilmək, təsdiq etmək və ona əməllə yerinə yetirmək

İkinciyə cavab : Muhəmməd Allahın Elçisidir – sözünü elmlə bilmək, təsdiq etmək, tabe olub, itaət edərək istənilıni həyata keçirməkdir.[15]

Həqiqətən də insan Lə iləhə illəllah tövhid kəliməsinin fəzilətlərini – orada olan əcr və savaba, dünya və axirətdə ağlına gəlməyəcək qədər çoxlu faydası olmasına görə sayması mümkün deyil. O bunu heç xəyalından da keçirə bilməz.Ümid edirəm ki, bu kəlimənin fəzilətlərini Peyğəmbərin*– sallalahu aleyhi vəssəlləm –*hədislərində varid olanlardan xülasə olaraq qeyd edəcəm.

Onun fəzilətlərindən : O mənaca ən böyük və ən fəzilətli əməldir, qul azad etməyə bərabərdir və o bu kəliməni söyləyənə şeytandan qoruyucu olur, necə ki, Səhih Buxari və Səhih Muslimdə Əbu Hurreyrədən*-radıyallahu anhu-* rəvayət olunan hədisdə Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* deyir : Kim Bir gündə 100 dəfə -

**( لَا إِلَهَ إِلَّا اللَّهُ وَحْدَهُ لَا شَرِيكَ لَهُ لَهُ الْمُلْكُ وَلَهُ الْحَمْدُ وَهُوَ عَلَى كُلِّ شَيْءٍ قَدِيرٌ ) - “Lə iləhə illəllahu vəhdəhu lə şərikə ləhu,ləhul mulku və ləhul həmdu və huva alə kulli şey`in qadir” -**

- Şəriki olmayan Allahdan başqa haqq ilah yoxdur, mülk və həmd ona məxsusdur və o hər şeyə Qadirdir – desə bu ona on qulu azad etməyinə bərabər olar, ona 100 savab yazılar, 100 günahı silinər, o günü axşama qədər ona şeytandan qoruyucu olar və heç kəs ondan daha əfzəl bir şey gətirə bilməz, yalnız bunu ondan daha çox edəndən başqa” [16]

Həmçinin bu barədə Əbu Əyyub əl-Ənsaridən*-radıyallahu anhu-* rəvayət olunur ki, Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* dedi : “ Kim onu (yuxarıdakı zikri) 10 dəfə desə bu ona İsmayıl övladından 4 qulu azad etmiş kimi sayılar”[17]

---

[15] İbnul Qeyyim “Zədul Məad” (1/34)
[16] Səhih Buxari (6403), Səhih Müslim (2691)
[17] Səhih Buxari (6404), Səhih Müslim (2693)

Və onun fəzilətlərindən : Peyğəmbərlərin*– sallalahu aleyhi vəssəlləm –* dediyi ən üstün kəlimədir, Peyğəmbərdən*– sallalahu aleyhi vəssəlləm –* sabit olan hədisdə deyilir : “ Ərəfə günü mənim və peyğəmbərlərin dediyi ən əfzəl söz -“Şəriki olmayan Allahdan başqa haqq ilah yoxdur, mülk və həmd ona məxsusdur və o hər şeyə Qadirdir”[18], digər ləfzdə isə : “ Ən xeyirli dua Ərəfə günü edilən duadır, mən və məndən əvvəlki peyğəmbərlərin dediyi ən üstün söz isə -“Şəriki olmayan Allahdan başqa haqq ilah yoxdur, mülk və həmd ona məxsusdur və o hər şeyə Qadirdir”[19] – zikridir.

Həmçinin bu sözün fəzilətlərindən : O Qiyamət günü günah səhifələrindən ağır gələcəkdir, necə ki, bu Abdullah ibn Amr ibn Asdan*-radıyallahu anhu-* “Müsnəd”, “Cəmiut-Tirmizi” və başqa kitablarda ceyyid ( yaxşı) sənədlə qeyd olunduğu üzrə Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* dedi : “Qiyamət günü mənim ümmətimdən bir kişi məxluqatın qarşısında çağırılar, onun 99 Sicili (Əməllər qeyd olunan kitab və ya dəftər) açılar, bunun hər biri (uzunluğu) gözün görmə məsafəsi qədər olur. Sonra Allah təalə ona deyər : Bunlardan nəyisə inkar edirsənmi ? Deyər : Xeyr, ey Rəbbim. Allah : Sənin bir üzrün və ya bir yaxşılığın varmı ? Kişi qorxaraq deyər : Xeyr ey Rəbbim. Allah Azzə və Cəllə deyər : Bəli, sənin bizim yanımızda bir xeyir əməlin var, sənə zülm olunmayacaq. Onun bir parça kağızı çıxardılar və orada :

**أَشْهَدُ أَنْ لَا إِلَهَ إِلَّا اللَّهُ وَ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ – “Əşhədu ən lə iləhə illəllah və ənnə Muhəmmədən abduhu və rasuluhu”**

Şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq heç bir haqq ilah (məbud) yoxdur və Muhəmməd onun qulu və elçisidir – sözləri olur.Deyər : Mənim bu birça kağızım bu kitabların yanında nə dəyəri olar ki ?! Allah : Sənə züm olunmayacaq.Və Kitablar tərəzinin bir gözünə kağız parçası isə digər gözünə qoyular, kitablar yüngül kağız isə ağır gələr.”[20]

Şübhə yoxdur ki, bu kağız parçasını kitablardan ağır edən onun Lə iləhə illəllahı qəlbindən iman ilə deməsi olur. İnsanlar qəlblərindəki imana görə əməllərində bir-birindən üstün olurlar. Elə olmasaydı nə qədər insan var ki, Lə iləhə illəllah deyir lakin imanının zəifliyinə görə bu deyilən heç də onun üçün keçərli olmur.Səhih Buxari və Səhih Muslimdə Ənəs ibn Məlikdən*-radıyallahu anhu-* varid olan hədisdə Rasulullah*– sallalahu aleyhi vəssəlləm –* deyir : “ Lə iləhə illəllah dediyi halda qəlbində arpa ağırlığında xeyir olan Cəhənnəmdən çıxarılar. Lə iləhə illəllah dediyi halda qəlbində buğda ağırlığında xeyir olan Cəhənnəmdən çıxarılar. Lə iləhə illəllah dediyi halda qəlbində zərrə qədər xeyir olan Cəhənnəmdən çıxarılar”[21] Bütün bunlar dəlalət edir ki, Lə iləhə illəllah deyənlər qəlblərində olan imana görə bir-birindən üstün olurlar.

Və bu kəlimənin fəzilətlərindən : Əgər o tərəzidə yer və göylərlə müqayisə olunsaydı çəkidə onlardan ağır gələrdi, necə ki “Müsnəd”də Abdullah ibn Amrdan-

---

[18] Təbərani “Dua” (874) Əli-radiyallahu anhu- hədisindən

[19] Tirmizi “Əl-Cami” (3585) Abdullah ibn Ömər hədisindən, Şeyx Albani “Silsilətus-Sahiha”da(4/ 7,8) həsən hədis saymış və demişdir : “Bu şahidlərin birliyi ilə hədis sabitdir”

[20] “Müsnəd”(2/213) ,“Cəmiut-Tirmizi” (2639), “Sunəni İbn Macə”(4300), Albani “Sahihul-Cami”də (8095) səhih demişdir

[21] Səhih Buxari (44), Səhih Müslim (325,193)

*radıyallahu anhu-* rəvayət olunan hədisdə Rasulullah*– sallalahu aleyhi vəssəlləm –* deyir : " Nuh ölüm anında öz oğluna dedi : Sənə Lə iləhə illəllahı əmr edirəm. Əgər yeddi qat yer və yeddi qat göy tərəzinin bir gözünə və Lə iləhə illəllah digər gözünə qoyulsaydı, Lə iləhə illəllah ağır gələrdi. Əgər yeddi qat səma qapalı bir halqa olsaydı Lə iləhə illəllah onu sındırardı."[22]

Və onun fəzilətlərindən : Onunla Allah arasında pərdə yoxdur, o arada olan bütün maneələri aşaraq Allaha doğru ucalır. "Tirmizi" həsən sənədlə Əbu Hurreyrədən rəvayət edir ki, Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* dedi : " Qul böyük günahlardan çəkindiyi müddətcə Lə iləhə illəllahı ixlaslı şəkildə dediyi elə bir vaxt olmaz ki, səmanın qapıları onun üzünə açılıb bu söz Ərşə qədər çatmasın."[23]

Və fəzilətlərindən : O ( yəni Lə iləhə illəllah) bu sözü deyən üçün Cəhənnəmdən xilasdır, Səhih Müslimdə isə deyilir : Peyğəmbərimiz Muhəmməd*– sallalahu aleyhi vəssəlləm –* müəzzini belə deyərkən eşidir : "Əşhədu ən Lə iləhə illəllah " və bunu deyir : " Oddan xilas oldu"[24] .Həmçinin Səhih Buxari və Səhih Müslimdə İtbəndən-*radıyallahu anhu-* gələn hədisdə Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* deyir : Həqiqətən də Allah Lə iləhə illəllah deyib bununla Allahın Üzünü istəyən kimsəni Cəhənnəmə haram etmişdir"[25]

Həmçinin bu kəlimənin fəzilətlərindən : Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* onu imanın ən üstün şöbəsi olduğunu bildirməsidir. İki Səhih əsərdə Əbu Hurreyradan-*radıyallahu anhu-* rəvayət olunan hədisdə Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* deyir : İman 70-dən çox şöbəsi vardır, ən üstünü Lə iləhə illəllah, ən aşağısı isə yoldan əziyyət verən şeyləri götürməkdir.[26]

Və fəzilətlərindən : Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* xəbər vermişdir ki, o ən əfzəl zikrdir, necə ki, bu "Tirmizi" və qeyri kitablarda keçdiyi üzrə Cabir ibn Abdullah-*radıyallahu anhu-* deyir : Rasulullahın*– sallalahu aleyhi vəssəlləm –* belə dediyini eşitdim : " Ən xeyirli zikr – Lə iləhə illəllah, ən xeyirli dua isə - Əlhəmdulilləh – dir"[27]

Və fəzilətlərindən : Kim bu sözü ixlaslı olaraq qəlbindən deyərsə Qiyamət günü Peyğəmbərin*– sallalahu aleyhi vəssəlləm –* şəfaəti ilə ən xoşbəxt insan olar."Səhih Buxari"də Əbu Hurreyra-*radıyallahu anhu-* rəvayət edir ki : Mən "Ey Allahın Rəsulu Qiyamət günü sənin şəfaətinlə ən çox xoşbəxt olan insan kimdir? Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* dedi : Ey Əbu Hurreyrə, sənin hədisə olan hərisliyinə görə bunu səndən qabaq kiminsə məndən soruşacağını düşünmürdüm. Qiyamət günü mənim şəfaətimlə ən çox xoşbəxt olan Lə iləhə illəllahı səmimi qəlbdən və ya canı-dildən deyən kəs olacaqdır."[28]

Və Peyğəmbərin*– sallalahu aleyhi vəssəlləm –* hədisdəki bu "Lə iləhə illəllahı səmimi qəlbədən və ya canı-dildən deyən kəs" - sözü dəlalət edir ki, eləcə yalnız dili ilə deyən insandan bu söz qəbul olunmaz, əksinə Kitab (Quran) və Sünnədə varid

---

[22] "Müsnəd" (2/170), Albani "Silsilətus-Sahiha"da(134) səhih demişdir
[23] "Cəmiut-Tirmizi" (3590), Albani "Sahihul-Cami"də (5647) həsən demişdir
[24] Səhih Müslim (382)
[25] Səhih Buxari (6938), Səhih Müslim (33,263)
[26] Səhih Buxari (9), Səhih Müslim (35)
[27] "Cəmiut-Tirmizi" (3383),"Sünəni İbn Macə"(3800), ), Albani "Sahihul-Cami"də (1104) həsən demişdir
[28] Səhih Buxari (99)

olmuş bu kəlimənin qeydlərini və şərtlərini yerinə yetirməlidir, bu söz yalnız dediyimiz halda qəbul olunar.



## Lə iləhə illəllah – ın şərtləri

Biz artıq Lə iləhə illəllah tövhid kəliməsinin fəzilətləri barədə danışdıq ki, o ən xeyirli, ən fəzilətli və ən uca kəlimədir və onu zikr etməyin nə qədər böyük savab olmasına, həmçinin əzəmətli üstünlüyünə, dünya və axirətdə xeyir və səmərələrinə də toxunduq.Lakin müsəlman bilməlidir ki, Lə iləhə illəllah yalnız dili ilə deməklə ondan qəbul olunmur. Onun haqqını və vacib olanlarını, həmçinin Kitab və Sünnədə varid olan şərtlərini yerinə yetirmək labüddür.Hər bir müsəlman bilir ki, onu Allaha yaxınlaşdıracaq hər bir itaət yalnız müəyyən şərtlərlə qəbul olunur. Məsələn namaz yalnız müəyyən şərtlərlə qəbul olunur, həmçinin həcc ibadəti də yalnız müəyyən şərtlərlə qəbul olunur, eləcə də Kitab və Sünnədə olan bütün ibadət növləri yalnız məlum şərtlərlə qəbul olunur.Bu xüsus Lə iləhə illəllah üçün də keçərlidir : Bu söz quldan yalnız onun Quran və Sünnədə keçən şərtlərini yerinə yetirməklə qəbul olunar.

Bizim Saleh Sələflərimiz*-rahiməhumullah-* də buna işarə edərək Lə iləhə illəllahın şərtərinin əhəmiyyətinə diqqətlə yanaşmağı, ona əməl etmənin vacibliyini və bunlarsız quldan qəbul olmayacağını bildirmişlər.Buna misal Həsən əl-Basri*-rahiməhullah-* haqqında deyilir ki, ona deyildi : İnsanlar deyirlər ki, kim "Lə iləhə illəllah" – desə cənnətə daxil olar.Cavabında : Kim "Lə iləhə illəllah" desə, onun haqqını versə və buyurduqlarını yerinə yetirsə Cənnətə daxil olar.

Və həmçinin digər nəqldə Həsən əl-Basri*-rahiməhullah-* öz həyat yoldaşını dəfn edən Fərazdəq adlı birinə deyir : Bu gününə nə hazırlamısan ? Dedi: 70 ildən bəridir ki, Lə iləhə illəllah şəhadətini...Həsən dedi : Necə də gözəl hazırlıqdır, lakin Lə iləhə illəllahın şərtləri vardır. Bundan əlavə səni namuslu qadınlara iftira etməkdən də çəkindirirəm.

Vəhb ibn Münəbbihdən*-rahiməhullah-* soruşuldu : Lə iləhə illəllah – cənnətin açarı deyilmi ? cavabında dedi : Bəli, lakin elə bir açar yoxdur ki, onun dişləri olmasın. Əgər sən dişləri olan açarla gəlsən qapı açılar, əks halda isə qapı açılmaz. – Dişlər deməklə o Lə iləhə illəllahın şərtlərinə işarə edirdi.[29]

Kitab və Sünnənin dəlillərini tədqiq və təhqiq edən elm əhli açıqlayaraq demişdir ki, Lə iləhə illəllahın bu 7 şərti olmasa qəbul olunmaz.Bunlar aşağıdakılardır :

1 – Elm, yəni inkar və isbatla olduğu halda, yəni cahillikdən (bilməməzlikdən) uzaq elm

2 – Yəqin ( yəni – Əminlik, əmin olma), şəkk və şübhədən uzaq yəqinlik

3 – İxlas (Səmimi qəlbdən), şirk və riyadan uzaq

4 – Sidq (Doğruluq), yalandan uzaq doğruluq, düzgünlük

5 – Məhəbbət (Sevgi), nifrətdən uzaq sevgi

6 – Tabe olma ( boyun əymək, itaət etmək), boyun qaçırmadan, imtina etmədən

7 – Qəbul etmək, rədd etməyin ziddi

---

[29] Bu nəqlləri İbn Rəcəb "Kəlimətul-İxlas"da (səh.14) qeyd etmişdir.

Artıq elm əhlindən bəzisi bu 7 şərti bir beytdə cəm etmişdir:

Elm, yəqin, ixlasın və sidqinlə birgə

Məhəbbət, tabeçilik və qəbul etməklə

İndi isə müxtəsər şəkildə bu şərtlərin hər birinin nə anlama gəldiyini açıqlamaq üçün bir az dayanaq, əlbəttə ki, Kitab və Sünnədən bəzi dəlillərini zikr etmək şərti ilə.[30]

Birinci şərt : O elmdir, burda istənilən inkar və isbatla olduğu halda, cahillikdən (bilməməzlikdən) uzaq elmdir. Yəni bu sözü deyən şəxs bilməlidir ki, o ibadətin bütün növlərini Allahdan qeyrisinə yönəltməyi inkar edir və bu ibadətlərin yalnız tək Allah üçün olmasını isbat edir (yəni bütün ibadətlər yalnız Allahın haqqıdır və Allaha edilməlidir). Necə ki, bu Allah təalənin bu ayəsində bildirilir :

﴿إِيَّاكَ نَعْبُدُ وَإِيَّاكَ نَسْتَعِينُ﴾

"Biz yalnız Sənə ibadət edir və yalnız Səndən kömək istəyirik" (Fatihə 5) – yəni Sənə ibadət edirik səndən başqasına yox, Səndən kömək istəyirik,başqasından yox.

Digər ayədə Allah demişdir :

﴿ فَاعْلَمْ أَنَّهُ لَا إِلَهَ إِلَّا اللَّهُ ﴾

"Bil ki, Allahdan başqa ibadətə layiq haqq ilah yoxdur" (Muhəmməd 19) Və başqa ayədə : ﴿ وَلَا يَمْلِكُ الَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ الشَّفَاعَةَ إِلَّا مَنْ شَهِدَ بِالْحَقِّ وَهُمْ يَعْلَمُونَ﴾

((Müşriklərin) Ondan qeyri ibadət etdikləri (Allah yanında heç bir kəs üçün) şəfaət edə bilməzlər. Mənasını bilərək haqqa şəhadət verənlər isə istisnadır.(Zuxruf 86) Təfsirçilər demişlər : Lə iləhə illəllaha şahidlik edənlər istisnadır,( Mənasını bilərək) yəni qəlblərində və dillərində şahidlik etdiklərinin mənasını bilmələri."Səhih Müslim"də Osman ibn Affəndən*-radıyallahu anhu-* sabit olan hədisdə Rasulullah*– sallalahu aleyhi vəssəlləm –* dedi : " Kim Lə iləhə illəllahı bildiyi halda ölsə Cənnətə daxil olar"[31].Burada Rasulullah*– sallalahu aleyhi vəssəlləm –* bilməyi (yəni elmi) şərt qoydu.

İkinci şərt : Yəqin ( yəni – əminlik, əmin olma), şəkk və şübhədən uzaq yəqinlikdir, digər məna ilə : Bu sözü deyən gərək söylədiyindən əmin olsun və heç bir şəkk-şübhə etməsin.Yəqin – Elmin tamlığı və kamiliyidir, Allah təalə möminləri vəsf edərkən buyurmuşdur :

﴿إِنَّمَا الْمُؤْمِنُونَ الَّذِينَ آمَنُوا بِاللَّهِ وَرَسُولِهِ ثُمَّ لَمْ يَرْتَابُوا وَجَاهَدُوا بِأَمْوَالِهِمْ وَأَنْفُسِهِمْ فِي سَبِيلِ اللَّهِ أُولَئِكَ هُمُ الصَّادِقُونَ﴾

"Möminlər ancaq Allaha və Onun Elçisinə iman gətirən, sonra heç bir şəkk-şübhəyə düşməyən, Allah yolunda malları və canları ilə cihad edənlərdir!

---

[30] Geniş açıqlama üçün bax : Şeyx Hafiz Həkəmi "Məaricul-Qabul" (1/377 və sonrakı səhifələr)

[31] Səhih Müslim (26)

(İmanlarında) sadiq olanlar da məhz onlardır.”(Hucurat 15) və “sonra heç bir şəkk-şübhəyə düşməyən” sözünün mənası yəqin və əmin olub heç şübhə etməyən deməkdir.

“Səhih Müslim”də Əbu Hurreyradan*-radıyallahu anhu-* rəvayət olunur ki, Rasulullah*– sallalahu aleyhi vəssəlləm –* dedi : ( Şahidlik edirəm ki, Allahdan başqa haqq ilah yoxdur (Lə iləhə illəllah) və mən də onun elçisiyəm, bu ikisinə (Əşhədu ən lə iləhə illəllah və əşhədu ənnə Muhəmmədən Rasulullah) şəkk-şübhə etmədiyi halda Allahla qarşılaşanı Allah yalnız Cənnətinə daxil edər”[32]

Eyni əsərdə yenə Əbu Hurreyradan*-radıyallahu anhu-* rəvayət olunan digər hədisdə isə Allah Rəsulu*– sallalahu aleyhi vəssəlləm –* demişdir : “ Bu hasarın o biri tərəfində Lə iləhə illəllaha qəlbiylə,yəqinlik və əminliklə şahidlik edən kimi qarşılasan onu Cənnətlə müjdələ.”[33] Burada isə yəqinliyi şərt qoydu.

Üçüncü şərt : İxlasdır (Səmimi qəlblə), şirk və riyadan uzaq halda olmalıdır.Bu da yalnız əməli saflaşdırmaq (xalis etmək), aşkar və gizli bütün nöqsan və qüsurlardan təmizlənməkdir.Bu bütün ibadətləri niyyəti ixlaslı edərək xalis olaraq tək Allaha etməkdir, Allah demişdir :

﴿أَلَا لِلَّهِ الدِّينُ الْخَالِصُ﴾

“Bil ki, xalis din (sırf ibadət, təmiz itaət) ancaq Allaha məxsusdur.” (Zumər 3) digər ayədə isə :

﴿وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَاءَ وَيُقِيمُوا الصَّلَاةَ وَيُؤْتُوا الزَّكَاةَ وَذَلِكَ دِينُ الْقَيِّمَةِ﴾

“Halbuki onlara əmr edilmişdi ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa (islama) dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!” (Beyyinə 5) Və “Səhih”də Əbu Hurreyradan*-radıyallahu anhu-* rəvayət olunan hədisdə Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* dedi : Qiyamət günü mənim şəfaətimlə ən çox xoşbəxt olan Lə iləhə illəllahı səmimi qəlbdən ( yəni ixlaslı) və ya canı-dildən deyən kəs olacaqdır.[34] Burada isə ixlası şərt qoydu.

Dördüncü şərt : Sidqdir (doğruluq), yalandan uzaq doğruluq, düzgünlükdür. Qul bu kəliməni söyləyərkən sidq qəlbdən deməlidir (yəni yalan qatmamalıdır).Sidq qəlblə dilin dediyinin uzlaşmasıdır (yəni dil qəlbdə olanı söyləyir). Buna görə də Allah təalə münafiqləri qınayaraq deyir :

﴿إِذَا جَاءَكَ الْمُنَافِقُونَ قَالُوا نَشْهَدُ إِنَّكَ لَرَسُولُ اللَّهِ وَاللَّهُ يَعْلَمُ إِنَّكَ لَرَسُولُهُ وَاللَّهُ يَشْهَدُ إِنَّ الْمُنَافِقِينَ لَكَاذِبُونَ﴾

“Münafiqlər sənin yanına gəldikləri zaman: “Biz şəhadət veririk ki, sən Allahın Elçisisən!”– deyirlər. Allah da bilir ki, sən Onun Elçisisən. Allah şahiddir ki, münafiqlər əsl yalançıdırlar.” (Münafiqlər 1) Allah onları yalançı olaraq vəsf etdi, çünki onların dillərində dedikləri söz qəlblərində yox idi, digər ayədə isə :

---

[32] Səhih Müslim (27)
[33] Səhih Müslim (31)
[34] Səhih Buxari (99)

﴿الم (1) أَحَسِبَ النَّاسُ أَنْ يُتْرَكُوا أَنْ يَقُولُوا آمَنَّا وَهُمْ لَا يُفْتَنُونَ (2) وَلَقَدْ فَتَنَّا الَّذِينَ مِنْ قَبْلِهِمْ فَلَيَعْلَمَنَّ اللَّهُ الَّذِينَ صَدَقُوا وَلَيَعْلَمَنَّ الْكَاذِبِينَ (3)﴾

"Əlif. Ləm. Mim. 2 .İnsanlar elə güman edirlər ki, təkcə: "İman gətirdik!"– demələri ilə onlardan əl çəkiləcək və onlar imtahan edilməyəcəklər? 3. Biz onlardan öncəkiləri də sınaqdan keçirmişdik. Sözsüz ki, Allah doğru danışanları da, yalançıları da aşkara çıxardacaqdır." (Ənkəbut 1-3) .İki səhihdə Muaz ibn Cəbəldən-*radıyallahu anhu*- nəql olunur ki, Nəbi– *sallalahu aleyhi vəssəlləm* – dedi : Sidqi qəlbdən (qəlbində doğru olaraq) Allahdan başqa haqq ilah olmadığına və Muhəmmədin onun qulu və elçisi olduğuna şahidlik edən elə bir kəs olmaz ki, Allah da onu Cəhənnəmə haram etməsin."[35] Burada isə sidqi (doğruluq) şərt qoydu.

Beşinci şərt : Məhəbbət (Sevgi), nifrətdən uzaq olan sevgidir. Bu kəliməni deyənin Allahı, Onun Rəsulunu, İslam dinini və bu dinin əmrlərini yerinə yetirib, hüdudlarını aşmayan müsəlmanları sevməsi, lə iləhə illəllaha xilaf olanlara (ona zidd hərəkətlər edənlər), bu kəlimənin şərtlərini pozanlara, şirk, küfr edənlərə nifrət etməsidir.Məhəbbətin imanda şərt olmasına dəlalət edən isə Allahın bu ayəsidir :

﴿وَمِنَ النَّاسِ مَنْ يَتَّخِذُ مِنْ دُونِ اللَّهِ أَنْدَادًا يُحِبُّونَهُمْ كَحُبِّ اللَّهِ وَالَّذِينَ آمَنُوا أَشَدُّ حُبًّا لِلَّهِ﴾

"İnsanlardan elələri də vardır ki, Allahdan qeyrilərini (Ona) tay tutur, onları da Allahı sevdikləri kimi sevirlər. İman gətirənlərin isə Allaha olan sevgisi daha güclüdür." (Bəqərə 165) Hədisdə isə deyilir : Ən güclü iman bağı (əlaqəsi) Allah üçün sevib, Allah üçün də nifrət etməkdir.[36]

Altıncı şərt : Tabe olma ( itaət etmək), boyun qaçırmadan və imtina etmədən.Bu sözü deyən insana Allahın şəriətinə tabe olmaq vacibdir. Onun hökmünə itaət etməli, özünü Allaha təslim etməlidir ki, bununla Lə iləhə illəllah dəstəyindən tutunmuş olsun.Allah təalə deyir :

﴿وَمَنْ يُسْلِمْ وَجْهَهُ إِلَى اللَّهِ وَهُوَ مُحْسِنٌ فَقَدِ اسْتَمْسَكَ بِالْعُرْوَةِ الْوُثْقَى﴾

"Kim yaxşı əməl sahibi olub özünü (səmimi-qəlbdən) Allaha təslim edərsə, o artıq ən möhkəm ipdən (dəstəkdən) yapışmış olar." (Loğman 22) Yəni artıq Lə iləhə illəllahdan tutunmuş olar.Burada Allah onun şəriətinə boyun əyməyi şərt qoydu. Bu da özünü ona təslim etməklə (tabeçiliklə) gerçəkləşir.

Yeddinci şərt : Qəbul etməkdir, bu rədd etməyin ziddidir.Bu kəliməni qəlblə və dillə haqqı ilə qəbul etmək vacibdir. Artıq Allah Qurani-Kərimdə bizdən əvvəlkilərin Lə iləhə illəllahı qəbul etdiklərinə görə xilas etdiyini və qəbul etməyib rədd edənlərin həlak olması xəbərlərini bizə çatdırmışdır.Allah təalə deyir :

﴿ثُمَّ نُنَجِّي رُسُلَنَا وَالَّذِينَ آمَنُوا كَذَلِكَ حَقًّا عَلَيْنَا نُنْجِ الْمُؤْمِنِينَ﴾

"Sonra peyğəmbərlərimizi və iman gətirənləri xilas edərik. Möminləri belə xilas etmək Bizə vacibdir." (Yunus 103) Müşriklər barədə isə Allah buyurmuşdur :

---

[35] Səhih Buxari (128), Səhih Müslim (32)
[36] Əhməd "Müsnəd" (4/286), Albani "Əs-Sahiha"da (1728) həsən demişdir.

﴿ إِنَّهُمْ كَانُوا إِذَا قِيلَ لَهُمْ لَا إِلَهَ إِلَّا اللَّهُ يَسْتَكْبِرُونَ (35) وَيَقُولُونَ أَئِنَّا لَتَارِكُو آلِهَتِنَا لِشَاعِرٍ مَجْنُونٍ (36) ﴾

"Çünki onlara: "Allahdan başqa (ibadətə layiq olan) ilah yoxdur!"– deyildikdə təkəbbür göstərir 36 . və deyirdilər: Məgər bir məcnun şairə görə ilahlarımızı tərk edəcəyik?" (Saffət 35-36)

Bunlar Lə iləhə illəllahın şərtləri idi. Tələb olunan heç də onların dalbadal sayılması və əzbərlənməsi deyil. Nə qədər avam insan olub ki, bunları özündə cəm edib, lakin ona desən ki, bunları əzbərdən say, o bunu bacarmaz. Elə əzbərçilər də var ki, ox kimi uçurlar, ancaq sən onun bu şətləri pozduğunu görürsən. O zaman tələb olunan insanda elm və əməlin birgə olmasıdır ki, o doğru olaraq Lə iləhə illəllah-ın əhlindən, haqlı olaraq tövhid əhlindən sayılsın.Buna müvəffəq edən və kömək edən tək Allah təalədir.Allahdan bizi bunu həyat keçirməyə müvəffəq etməsini diləyirik, Həmd təkcə Allaha məxsusdur.



## Lə iləhə illəllah tövhid kəliməsinin məna və məqsədi

Həqiqətən də lə iləhə illəllah tövhid kəliməsi ən xeyirli, ən əfzəl, ən kamil zikrdir. O təkcə mücərrəd tələfüzlə Allah qatında qəbul olunmaz.Yalnız o zaman qəbul olunar ki, qul onun mənasının həqiqətini yerinə yetirib, məqsədinin əsası olan şirki inkar edib təkliyin Allaha aidliyini həyata keçirər. Və onun özündə daşıdığı mənaya qəti etiqad edib ona əməl edər.Bununla insan əsl müsəlman olur. Bununla o Lə iləhə illəllah-ın əhlindən sayılır.

Bu əzəmətli kəlimə Allahdan başqa bütün hər şeyin ilahlığını inkar edir.Allahdan başqa hər şeyin ilahlığı batillərin batilidir. Bunu isbat etmək ən böyük zülm və zəlalətin ən son həddidir.Allah təalə deyir :

﴿وَمَنْ أَضَلُّ مِمَّنْ يَدْعُو مِنْ دُونِ اللَّهِ مَنْ لَا يَسْتَجِيبُ لَهُ إِلَى يَوْمِ الْقِيَامَةِ وَهُمْ عَنْ دُعَائِهِمْ غَافِلُونَ (5) وَإِذَا حُشِرَ النَّاسُ كَانُوا لَهُمْ أَعْدَاءً وَكَانُوا بِعِبَادَتِهِمْ كَافِرِينَ (6)﴾

“Allahı qoyub Qiyamət gününədək özünə cavab verə bilməyənlərə yalvaran kimsədən daha çox azmış kim ola bilər? Halbuki (çağırdıqları ilahlar) onların yalvarışından xəbərsizdirlər.6 İnsanlar bir yerə toplanılacaqları zaman (çağırdıqları ilahlar) onlara düşmən kəsiləcək və onların ibadətini inkar edəcəklər.” (Əhqaf 5-6) digər ayədə :

﴿ ذَلِكَ بِأَنَّ اللَّهَ هُوَ الْحَقُّ وَأَنَّ مَا يَدْعُونَ مِنْ دُونِهِ هُوَ الْبَاطِلُ وَأَنَّ اللَّهَ هُوَ الْعَلِيُّ الْكَبِيرُ﴾

“Bu belədir. Çünki Allah haqq, (müşriklərin) Ondan başqa ibadət etdikləri (bütlər, ilahlar) isə batildir. Həqiqətən, Allah (hər şeydən) ucadır, böyükdür!” (Həcc 22) digər ayədə isə

﴿ وَإِذْ قَالَ لُقْمَانُ لِابْنِهِ وَهُوَ يَعِظُهُ يَا بُنَيَّ لَا تُشْرِكْ بِاللَّهِ إِنَّ الشِّرْكَ لَظُلْمٌ عَظِيمٌ﴾

“Bir zaman Loğman öz oğluna nəsihət edərək demişdi: Oğlum! (Allaha) şərik qoşma. Həqiqətən, Allaha şərik qoşmaq böyük zülmdür!” (Loğman 13) başqa bir ayədə isə :

﴿ وَالْكَافِرُونَ هُمُ الظَّالِمُونَ﴾

“ Kafirlər isə zalımdırlar.” (Bəqərə 254). Zülm bir şeyi öz yerinə qoymamaqdır. Şübhəsiz ki, ibadətləri Allahdan qeyrisinə yönəltmək də zülmdür.Ona görə ki, onları öz yerinə qoymur və bu zülmün ən böyüyü və ən təhlükəlisidir.

Bu əzəmətli Lə iləhə illəllah kəliməsinin məqsədini anlamaq, mənasını dəqiqləşdirmək lazımdır. Yoxsa elm əhlinin icması ilə mənasını başa düşmədən sadəcə demək və tələblərinə əməl etməmək insana fayda verməz.Allah təalə buyurur :

﴿ وَلَا يَمْلِكُ الَّذِينَ يَدْعُونَ مِنْ دُونِهِ الشَّفَاعَةَ إِلَّا مَنْ شَهِدَ بِالْحَقِّ وَهُمْ يَعْلَمُونَ﴾

“(Müşriklərin) Ondan qeyri ibadət etdikləri (Allah yanında heç bir kəs üçün) şəfaət edə bilməzlər. Mənasını bilərək haqqa şəhadət verənlər isə istisnadır.”

(Zuxruf 86) Təfsirçilərə görə ayənin mənası : Yalnız o kəslər istisnadır ki, onlar Lə iləhə illəllaha şahidlik edərkən qəlblərində dilləri ilə dediklərini bilirlər. O zaman şəhadət – şahidlik etdiyinin mənasını bilməyini tələb edir. Əgər bu cahilliklə (bilmədən) olsa onda şəhadət sayılmaz. Həmçinin sadiqliyi (doğruçuluq) və buna əməli də tələb edir. Buradan aydın olur ki, bu kəlimənin mənasını bilmək (elm), bildiyinə əməl etmək və sadiq olmaq (yalan qatmamaq) lazımdır.Elm insanı elmsiz əməl edən xristianların yolundan xilas edir. Əməl isə öz elmlərinə ( bildiklərinə) əməl etməyən yəhudilərin yolundan azad edir. Sidq isə qəlblərində olmayanı əməllərində göstərən münafiqlərin yolundan ayırır. Bununla da qul Alahın doğru yoluna – nemət verdiklərinin yoluna yönəlmiş olur, qəzəbə uğrayanların və zəlalətə düşənlərin yoluna deyil.

Xülasə olaraq : Lə iləhə illəllah yalnız mənasını - yəni nəyi inkar edib, nəyi isbat etdiyini bilənə və buna etiqad edib əməl edənə fayda verir.Ancaq kim bu kəliməni deyib etiqad etmədən zahirən əməl etsə o münafiqdir (ikiüzlüdür). Kim də bu sözü deyib onun ziddinə olaraq şirk etsə o kafirdir. Həmçinin kim də bu sözü deyib sonra İslamın vaciblərindən və haqlarından nəyisə inkar edib dindən çıxarsa, İslamı tərk edər. Atarsa (mürtəd olarsa) bu da ona fayda verməz, hətta o bu sözü 1000 dəfə desə də. Eləcə də kim bu sözü deyib eyni zamanda ibadətin hər hansı birini – dua, qurban kəsmə, nəzir, kömək istəmək, təvəkkül etmə, tövbə, ümid etmək, qorxmaq, məhəbbət və s.-ni, bu ibadətlərdən hər hansı birini yalnız Allaha edilməli olduğu halda Allahdan başqasına yönəltsə o müşrik olar. Hətta bu əzəmətli kəlimənin mənası – tövhid və ixlasın tələbi olan əməli etməzsə, dili ilə dediyi halda belə bu hökm dəyişməz.[37]

Lə iləhə illəllahın mənası : Tək bir ilahdan (Allahdan) başqa haqq ilah (məbud ) yoxdur, o da tək və şəriksiz olan Allahdır. İlah lüğətdə - ibadət olunan deməkdir. Lə iləhə illəllah : yəni Allahdan başqa ibadətə haqqı olan ilah yoxdur, necə ki, Uca Allah buyurur :

﴿ وَمَا أَرْسَلْنَا مِنْ قَبْلِكَ مِنْ رَسُولٍ إِلَّا نُوحِي إِلَيْهِ أَنَّهُ لَا إِلَهَ إِلَّا أَنَا فَاعْبُدُونِ ﴾

“(Ey Rəsulum!) Səndən əvvəl elə bir peyğəmbər göndərmədik ki, ona: “Məndən başqa heç bir haqq ilah yoxdur, elə isə (yalnız) Mənə ibadət edin!” – deyə vəhy etməyək.”(Ənbiya 25) digər ayədə isə :

﴿ وَلَقَدْ بَعَثْنَا فِي كُلِّ أُمَّةٍ رَسُولًا أَنِ اعْبُدُوا اللَّهَ وَاجْتَنِبُوا الطَّاغُوتَ ﴾

“Biz hər ümmətə: “Allaha ibadət edin və tağutdan (Allahdan başqa ibadət olunanlardan) uzaq olun”– (deyə), elçi göndərdik.”(Nəhl 16).Bununla da aydın olur ki, ilahın mənası ibadət olunandır (məbud). Lə iləhə illəllahın mənası isə ixlaslı ibadəti tək Allaha yönəltmək və tağutdan çəkinməklə olur. Buna görə də Peyğəmbər– *sallalahu aleyhi vəssəlləm* – Qureyş kafirlərinə deyəndə ki : Lə iləhə illəllah – deyin, onlar dedilər :

[37] “Teysirul Azizul Həmid” (səh.78)

﴿ أَجَعَلَ الْآلِهَةَ إِلَهًا وَاحِدًا إِنَّ هَذَا لَشَيْءٌ عُجَابٌ﴾

“O, bütün ibadət olunanları bir ilahmı etdi ? Bu, doğrudan da, çox təəccüblü bir şeydir.” (Sad 5)

Hud qövmü də onlara – Lə iləhə illəllah deyin – söyləndikdə öz peyğəmbərinə belə demişdi :

﴿ أَجِئْتَنَا لِنَعْبُدَ اللَّهَ وَحْدَهُ وَنَذَرَ مَا كَانَ يَعْبُدُ آبَاؤُنَا﴾

“Yanımıza gəlmisən ki, atalarımızın ibadət etdiklərini buraxıb tək Allaha ibadət edək? “ (Ə`raf 70) .Onlar yalnız Lə iləhə illəllaha çağırıldıqda bunu dedilər, çünki onlar başa düşürdülər ki, bu sözü söyləmək Allahdan başqa ibadət olunan hər şeyi inkar edib bu ibadətlərin yalnız şəriki olmayan Allah üçün olduğunu isbat etmək deməkdir.Elə isə Lə iləhə illəllah özündə inkar və isbatı daşıyır. Allahdan başqa hər şeyin ilahlığını ( ibadət olunmasını) inkar edir. Yəni Allahdan savayı hər şeyi – mələkləri və peyğəmbərləri də - o ki qalsın hələ başqaları – heç biri ilah deyil, ibadətdən heç bir payları yoxdur. Bununla da ilahiyyat (ibadət olunmaq) yalnız tək Allah üçün isbat olunmuş olar. Yəni qul Ondan (Allah) başqa heç kəsi ilahlaşdırmır, ibadətdən heç birini qəsd etmir. Çünki ilahlaşdırmaq qəlbin ibadətin hansısa bir növüylə– dua, qurban, nəzir və başqalarıyla bağlanmasını qəsd etməkdir.

Qurani –Kərimdə Lə iləhə illəllah tövhid kəliməsinin mənasını açıqlayan çox sayda dəlillər gəlmişdir, bununla da məqsəd izah olunur.Misal olaraq Allahın bu ayəsi :

﴿ وَإِلَهُكُمْ إِلَهٌ وَاحِدٌ لَا إِلَهَ إِلَّا هُوَ الرَّحْمَنُ الرَّحِيمُ﴾

“Sizin ilahınız Tək olan İlahdır. Ondan başqa haqq ilah yoxdur, Mərhəmətlidir, Rəhmlidir.” (Bəqərə 163) və başqa ayədə :

﴿ وَمَا أُمِرُوا إِلَّا لِيَعْبُدُوا اللَّهَ مُخْلِصِينَ لَهُ الدِّينَ حُنَفَاءَ وَيُقِيمُوا الصَّلَاةَ وَيُؤْتُوا الزَّكَاةَ وَذَلِكَ دِينُ الْقَيِّمَةِ﴾

“Halbuki onlara əmr edilmişdir ki, Allaha – dini yalnız Ona məxsus edərək, batildən haqqa (islama) dönərək – ibadət etsinlər, namaz qılıb zəkat versinlər. Doğru-düzgün din budur!” (Beyyinə 5) digər yerdə isə :

﴿وَإِذْ قَالَ إِبْرَاهِيمُ لِأَبِيهِ وَقَوْمِهِ إِنَّنِي بَرَاءٌ مِمَّا تَعْبُدُونَ (26) إِلَّا الَّذِي فَطَرَنِي فَإِنَّهُ سَيَهْدِينِ (27) وَجَعَلَهَا كَلِمَةً بَاقِيَةً فِي عَقِبِهِ لَعَلَّهُمْ يَرْجِعُونَ (28) ﴾

“Bir zaman İbrahim öz atasına və qövmünə demişdi: “Mən sizin ibadət etdiklərinizdən uzağam.27. Yalnız məni yaradandan başqa! Şübhəsiz ki, O məni doğru yola yönəldəcəkdir .28.O bunu (lə ilahə illəllah kəlməsini) öz nəsli arasında daimi qalacaq bir kəlmə etdi ki, bəlkə (doğru yola) qayıtsınlar.”(Zuxruf 26-28).Allah təalə mömin haqda danışarkən isə :

﴿وَمَا لِيَ لَا أَعْبُدُ الَّذِي فَطَرَنِي وَإِلَيْهِ تُرْجَعُونَ (22) أَأَتَّخِذُ مِنْ دُونِهِ آلِهَةً إِنْ يُرِدْنِ الرَّحْمَنُ بِضُرٍّ لَا تُغْنِ عَنِّي شَفَاعَتُهُمْ شَيْئًا
وَلَا يُنْقِذُونِ (23) إِنِّي إِذًا لَفِي ضَلَالٍ مُبِينٍ (24)﴾

“22.Mənə nə olub ki, məni yaradana və hüzuruna qaytarılacağınız (Allaha) ibadət etməyim?23. Mən heç Ondan başqa məbudlar qəbul edərəmmi? Əgər Mərhəmətli (Allah) mənə bir zərər yetirmək istəsə, onların şəfaəti mənə heç bir fayda verməz və onlar məni xilas edə bilməzlər.24.Bax onda mən açıq-aydın azğınlığa düşmüş olaram.”(Yəsin 22-24).Başqa yerdə isə Allah belə buyurmuşdur :

﴿قُلْ إِنِّي أُمِرْتُ أَنْ أَعْبُدَ اللَّهَ مُخْلِصًا لَهُ الدِّينَ (11) وَأُمِرْتُ لِأَنْ أَكُونَ أَوَّلَ الْمُسْلِمِينَ (12) قُلْ إِنِّي أَخَافُ إِنْ عَصَيْتُ رَبِّي
عَذَابَ يَوْمٍ عَظِيمٍ (13) قُلِ اللَّهَ أَعْبُدُ مُخْلِصًا لَهُ دِينِي (14)﴾

“11.De: “Mənə, dini yalnız Allaha məxsus edərək, Ona ibadət etmək əmr olunmuşdur.12. Mənə həm də müsəlmanların birincisi olmaq əmr olunmuşdur”.13. De: “Rəbbimə asi olsam, o əzəmətli günün əzabından qorxuram”.14. De: Mən dinimi məhz Allaha məxsus edərək yalnız Ona ibadət edirəm.”(Zumər 11-14) Həmçinin Allah təalə Firon ailəsindən olan mömin haqqında danışarkən buyurur :

﴿وَيَا قَوْمِ مَا لِي أَدْعُوكُمْ إِلَى النَّجَاةِ وَتَدْعُونَنِي إِلَى النَّارِ (41) تَدْعُونَنِي لِأَكْفُرَ بِاللَّهِ وَأُشْرِكَ بِهِ مَا لَيْسَ لِي بِهِ عِلْمٌ وَأَنَا أَدْعُوكُمْ
إِلَى الْعَزِيزِ الْغَفَّارِ (42) لَا جَرَمَ أَنَّمَا تَدْعُونَنِي إِلَيْهِ لَيْسَ لَهُ دَعْوَةٌ فِي الدُّنْيَا وَلَا فِي الْآخِرَةِ وَأَنَّ مَرَدَّنَا إِلَى اللَّهِ وَأَنَّ الْمُسْرِفِينَ هُمْ
أَصْحَابُ النَّارِ (43)﴾

“41.Ey qövmüm! Nə üçün mən sizi nicat tapmağa çağırıram, siz isə məni oda çağırırsınız?42. Siz məni Allaha küfr etməyə, bilmədiyim bir şeyi Ona şərik qoşmağa çağırırsınız, mən isə sizi Qüdrətli və Bağışlayan (Allaha) çağırıram.43. Heç şübhəsiz ki, sizin məni çağırdıqlarınızın nə dünyada, nə də axirətdə çağırılmağa haqqı yoxdur. Bizim dönüşümüz Allahadır. Həddi aşanlar isə od sakinləridirlər.”(Mumin 41-43) Bu mənada ayələr olduqca çoxdur. Bu ayələr bir daha izah edir ki, Lə iləhə illəllahın mənası – Allahdan başqa ona tay tutulanlara, şəfaətçilərə ibadətdən uzaqlaşıb bu ibadətləri tək Allaha yönəltməkdir.Məhz bu Allahın öz elçilərini göndərdiyi, onunla kitabları endirdiyi haqq din və doğru yoldur. Ancaq insanın mənasını bilmədən Lə iləhə illəllah deməsi, tələblərinə əməl etməməsi, hətta bəzən dua, qorxu, qurban, nəzir və başqa ibadətlərdən bir hissəsini Allahdan başqasına yönəltməsi – bütün bunlar qulun Lə iləhə illəllah əhlindən sayılmasına kifayət deyil. Qiyamət günü də onu Allahın əzabından xilas edə bilməz.[38]

Lə iləhə illəllah bəzilərinin zənn etdiyi kimi nə mənasız isim, nə həqiqəti olmayan söz , nə də ki məzmunsuz ləfz deyil. O insanlar inanırlar ki, bu sözə riayət etmək qəlbində heç bir mənasına etiqad etmədən yalnız nitq ilə söyləməkdir. Yaxud da üsul və əsaslarını yerinə yetirmədən dillə tələffüz etməkdir. Bu əzəmətli kəlimənin dəyəri isə qəti olaraq bu deyil, əksinə bu əzəmətli mənası olan bir isim, uca mənası olan bir sözdür. O bütün mənalardan daha şərəfli və hörmətlidir. Nəticə olaraq o Allahdan başqa hər şeyin ibadətindən uzaqlaşma, Allaha tabeçilik və

[38] “Teysirul Azizul Həmid” (səh.140)

itaətlə, ümid və istəklə, ona tərəf dönmə və təvəkküllə, dua və yalvarışla olan yaxınlaşmadır.Və “Lə iləhə illəllah” tərəfdarı yalnız Allahdan istəyər, yalnız Allahdan kömək tələb edər, yalnız Allaha təvəkkül edər, yalnız Allaha ümid edər, yalnız Allaha qurban kəsər və ibadətin hansısa birini Allahdan başqasına sərf etməz, Allahdan başqa ibadət olunan hər şeyə küfr edər ( yəni inkar edər) və bunlardan uzaq olub Allaha yönələr.

İndi isə daha əzəmətli bir məsələ gəlir ! Bu məsələ indiki mövzunu açıqlayır və izah edir, müvəffəqiyyət tək Allahın Əlindədir və bizə yalnız o kömək edir.



## Lə iləhə illəllah şəhadətini pozan amillər

Biz artıq Lə iləhə illəllah tövhid kəliməsinin şərtlərini keçdik ki, bunlar Allah qatında qəbul olunması üçün qulda olmalıdır.Bunlar dəyəri əzəmətli, qədr-qiyməti uca olan şərtlərdir. Hər bir müsəlmana vacibdir ki, buna böyük qayğı ilə yanaşıb ciddi əhəmiyyət versin. Bu xüsusda müsəlmanın əhəmiyyət verməsi vacib olan bu kəliməni pozan amilləri bilməsidir ki, onlardan çəkinsin.Allah təbərakə və təalə bu fəzilətli kəliməni haqlarını yerinə yetirən möminin tutacağı yolu öz kitabında açıqlamışdır. Həmçinin bu kəliməyə qarşı əks hərəkət edən günahkarların da yolunu ətraflı şəkildə açıqlamışdır. Daha sonra bunların da onların da əməllərini və aqibətlərinin nə olduğunu açıqlamışdır. Həmçinin birincilərin müvəffəqiyyət qazanmaqlarının, ikincilərin isə uğursuzluq əldə etmələrinin səbəblərini də izah etmişdir.Allah hər ikisinin həqiqətlərini ortaya qoymaq məqsədiylə onları öz kitabında açıqlamış və izah etmişdir, bu haqda Allah təalə buyurur :

﴿ وَكَذَلِكَ نُفَصِّلُ الْآيَاتِ وَلِتَسْتَبِينَ سَبِيلُ الْمُجْرِمِينَ﴾

"Biz ayələrimizi belə müfəssəl izah edirik ki, günahkarların yolu açıq-aydın bilinsin." (Ən`am 55).Həmçinin digər ayədə isə :

﴿ وَمَنْ يُشَاقِقِ الرَّسُولَ مِنْ بَعْدِ مَا تَبَيَّنَ لَهُ الْهُدَى وَيَتَّبِعْ غَيْرَ سَبِيلِ الْمُؤْمِنِينَ نُوَلِّهِ مَا تَوَلَّى وَنُصْلِهِ جَهَنَّمَ وَسَاءَتْ مَصِيرًا﴾

"Hər kəs doğru yol ona bəlli olduqdan sonra Peyğəmbərə qarşı çıxsa və möminlərin yolundan başqa bir yolla getsə, onu üz tutduğu yola yönəldər və Cəhənnəmdə yandırarıq. Ora nə pis dönüş yeridir."(Nisə 115). Kim günahkarların yolunu bilməzsə, onların yolunu tanımağa çalışmasa, onların batilləri üzərində olmalarına şəkk-şübhə edərsə...Elə məhz buna görə də Möminlərin Əmiri Ömər ibn Xəttab*-radıyallahu anhu-* demişdir : Kim İslamda yaşayıb cahiliyyəti bilməzsə İslamın bağları (ipi, əlaqəsi) bir-bir çözülər.[39]

Buna görə də Kitab və Sünnədə Lə iləhə illəllah tövhid kəliməsinə zidd olan riddət (mürtəd olma – İslamdan çıxma) və sair şirk və küfr növlərinə aid çoxlu dəlillər gəlmişdir.Alimlər bunu fiqh kitablarında "Mürtədin hökmü" başlığı altında zikr etmişlər : Müsəlman bir çox İslamı pozan amillərlə dindən çıxır (riddət edir), əgər bu amillər onda baş verərsə dindən çıxar və ona Lə iləhə illəllahı quru tələffüz etməsi fayda verməz. Halbuki bu əzəmətli kəlimə ən xeyirli və ən fəzilətli zikrdir.Şərtlərini yerinə yetirib onu pozan amillərdən uzaqlaşmayana qədər bu sözün onu deyənə heç bir xeyri dəyməz.

Şübhə yoxdur ki, müsəlmanın İslamı pozan bu amilləri bilməsində onun dininə böyük faydaları vardır. Bunu bilməkdə məqsədi bu şərlərdən qorunmaq və bəla və müsibətlərdən xilas olmağı istəməlidir.Buna görə də kim şirk və küfrü, batili və ona gedən yolları bilərsə , ona nifrət edər, ondan çəkinər və çəkindirərsə, öz nəfsindən uzaqlaşdırar və imanını zədələməyə qoymazsa, onun haqda bilgisini artırarsa ki, haqqa bəsirətlə və sevgiylə baxsın və ondan qorunsun, məhz bu zaman bu bilginin ona Allahdan başqa heç kəsin bilmədiyi qədər xeyirləri və faydaları

[39] İbnul Qeyyim "Əl-Fəvaid" (səh.201 və ondan sonrakı səhifələr)

olar. Allah təalə izlənilməsi və sevilməsi üçün haqq yolunun bilinməsini istəyər, eləcə də uzaqlaşıb nifrət olunması üçün də batil yolunun bilinməsini istəyər.Ona görə də necə ki müsəlman xeyir yolunu onu həyatına tətbiq etmək üçün öyrənir, eləcə də tələb olunur ki, o şərr yolundan uzaqlaşmaq üçün onu öyrənsin.İki "Səhih"də rəvayət olunur ki, Huzeyfə ibn Yəmən*-radıyallahu anhu-* demişdir : Səhabələr Rasulullaha*– sallalahu aleyhi vəssəlləm –* xeyir haqda soruşurdular, mən isə şərrə düşmək qorxusundan ondan pis şeyləri soruşurdum.[40]

Buna görə deyilmişdir ki :

Şərri şərr üçün öyrənmədim, əksinə şərrindən qorunmaq üçün,
İnsanlardan şərri bilməyən, bu şərr olana düşər bilmədən.

İş belə olduğu halda, bu əhəmiyyətinə görə hər bir müsəlmanın üzərinə vacibdir ki, onlardan çəkinməsi üçün Lə iləhə illəllahı pozan amilləri öyrənsin.Bu kəlimə az öncə keçdiyi kimi bir çox amillərlə pozula bilər. Lakin alimlərdən çoxunun[41] da qeyd etdiyi kimi bu amillərin təhlükə cəhətdən ən şiddətliləri və ən çox baş verəni 10 amildir. İndi isə müxtəsər və qısa şəkildə bu amillər zikr olunacaq ki, müsəlman özünü və digər müsəmanları qorumaq üçün bunlardan çəkinsin və başqalarını da xəbərdar etsin :

Birinci amil : Allah ibadətdə şərik qoşmaqdır, Allah təalə deyir :

﴿ إِنَّ اللَّهَ لَا يَغْفِرُ أَنْ يُشْرَكَ بِهِ وَيَغْفِرُ مَا دُونَ ذَلِكَ لِمَنْ يَشَاءُ ﴾

"Şübhəsiz ki, Allah Ona şərik qoşmağı bağışlamayacaq. Bundan daha aşağı (günahları ) isə istədiyi kimsəyə bağışlayacaqdır." (Nisə 116) Digər ayədə isə:

﴿ إِنَّهُ مَنْ يُشْرِكْ بِاللَّهِ فَقَدْ حَرَّمَ اللَّهُ عَلَيْهِ الْجَنَّةَ وَمَأْوَاهُ النَّارُ وَمَا لِلظَّالِمِينَ مِنْ أَنْصَارٍ ﴾

"Həqiqətən də, Allaha şərik qoşan kimsəyə, Allah Cənnəti haram etmiş və onun sığınacağı yer Oddur. Zalımlara kömək edən olmayacaqdır"(Məidə 72) Buna misal: Ölülərə (onların nəsə verməsi üçün və ya hansısa bəla və müsibəti uzaqlaşdırması üçün) dua etmək və onlardan kömək istəmək, onlara qurban kəsmək, nəzir demək və s. bunun kimi əməllər.

İkinci amil : Kim özü ilə Allah arasında vasitəçi təyin edər, ona dua edər, ondan şəfaət istəyər, ona təvəkkül edərsə o alimlərin icması ilə kafir olar.Allah təalə deyir:

[40] Səhih Buxari (3606), Səhih Müslim (1847)
[41] Bax : "Əddurarus-Səniyyə fil-Əcvibətin Nəcdiyyə" (2/232 və sonrakı səhifələr)

﴿وَيَعْبُدُونَ مِنْ دُونِ اللَّهِ مَا لَا يَضُرُّهُمْ وَلَا يَنْفَعُهُمْ وَيَقُولُونَ هَؤُلَاءِ شُفَعَاؤُنَا عِنْدَ اللَّهِ قُلْ أَتُنَبِّئُونَ اللَّهَ بِمَا لَا يَعْلَمُ فِي السَّمَاوَاتِ وَلَا فِي الْأَرْضِ سُبْحَانَهُ وَتَعَالَى عَمَّا يُشْرِكُونَ﴾

"Onlar Allahı qoyub özlərinə nə bir zərər, nə də bir fayda verə bilənlərə ibadət edir və: "Onlar Allahın dərgahında bizim şəfaətçilərimizdir!"– deyirlər. De: "Yoxsa Allaha göylərdə və yerdə bilmədiyi bir şeyimi xəbər verirsiniz?" (Allah) onların qoşduqları şəriklərdən uzaqdır və ucadır." (Yunus 18)

Üçüncü amil : Kim müşrikləri (Allaha şərik qoşanları) təkfir etməz (onlara kafir hökmünü vermək), onların küfrlərində şübhə edər, yaxud da onların doğru yolda olduğunu deyərsə özü kafir olar.

Dördüncü amil : Kim başqasının yolunun Peyğəmbərin– *sallalahu aleyhi vəssəlləm* – yolundan daha mükəmməl olduğunu, yaxud tağutların hökmünə üstünlük verən şəxs kimi başqa hökmün Peyğəmbərin– *sallalahu aleyhi vəssəlləm* – hökmündən daha yaxşı olduğunu etiqad edərsə kafir olar.

Beşinci amil : Özü əməl etsə belə kim Peyğəmbərin– *sallalahu aleyhi vəssəlləm* – gətirdiyi dindən nəyəsə nifrət bəsləsə kafir olar :

﴿ ذَلِكَ بِأَنَّهُمْ كَرِهُوا مَا أَنْزَلَ اللَّهُ فَأَحْبَطَ أَعْمَالَهُمْ﴾

"Bu ona görədir ki, onlar Allahın nazil etdiyinə (Qurana) nifrət etdilər, O da onların əməllərini puça çıxartdı." (Muhəmməd 9)

Altıncı amil : Kim Rasulullahın– *sallalahu aleyhi vəssəlləm* – dinindəki bir şeyə, yaxud onun savabı və ya cəzasına istehza edər,lağa qoyarsa kafir olar.Dəlil :

﴿وَلَئِنْ سَأَلْتَهُمْ لَيَقُولُنَّ إِنَّمَا كُنَّا نَخُوضُ وَنَلْعَبُ قُلْ أَبِاللَّهِ وَآيَاتِهِ وَرَسُولِهِ كُنْتُمْ تَسْتَهْزِئُونَ (65) لَا تَعْتَذِرُوا قَدْ كَفَرْتُمْ بَعْدَ إِيمَانِكُمْ﴾

"65.Onlardan (nə üçün istehza etdiklərini) soruşsan, deyərlər: "Biz sadəcə boş-boş danışıb zarafatlaşırdıq!" De: Allaha, Onun ayələrinə və Onun Elçisinə istehzamı edirsiniz? 66. Üzrxahlıq etməyin! İman gətirdikdən sonra siz artıq kafir oldunuz " (Tövbə 65-66)

Yedinci amil : Sehrdir, buna misal ayırma və bağlama (qovuşdurma) sehridir.(ən çox kişi və qadını bir-birinə sevdirmək ya da bir-birindən ayırmaq üçün edilir-tərc.).Kim sehri edər yaxud ondan razı qalarsa kafir olar.Dəlil Allah təalənin bu sözüdür :

﴿وَاتَّبَعُوا مَا تَتْلُو الشَّيَاطِينُ عَلَى مُلْكِ سُلَيْمَانَ وَمَا كَفَرَ سُلَيْمَانُ وَلَكِنَّ الشَّيَاطِينَ كَفَرُوا يُعَلِّمُونَ النَّاسَ السِّحْرَ وَمَا أُنْزِلَ عَلَى الْمَلَكَيْنِ بِبَابِلَ هَارُوتَ وَمَارُوتَ وَمَا يُعَلِّمَانِ مِنْ أَحَدٍ حَتَّى يَقُولَا إِنَّمَا نَحْنُ فِتْنَةٌ فَلَا تَكْفُرْ فَيَتَعَلَّمُونَ مِنْهُمَا مَا يُفَرِّقُونَ بِهِ بَيْنَ الْمَرْءِ وَزَوْجِهِ وَمَا هُمْ بِضَارِّينَ بِهِ مِنْ أَحَدٍ إِلَّا بِإِذْنِ اللَّهِ وَيَتَعَلَّمُونَ مَا يَضُرُّهُمْ وَلَا يَنْفَعُهُمْ وَلَقَدْ عَلِمُوا لَمَنِ اشْتَرَاهُ مَا لَهُ فِي الْآخِرَةِ مِنْ خَلَاقٍ﴾

“Onlar Suleymanın səltənətində şeytanların oxuduqlarının ardınca getdilər. Süleyman kafir olmadı. Lakin şeytanlar sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanı insanlara öyrədərək kafir oldular. (Mələklər): “Biz ancaq bir sınağıq, sən gəl kafir olma!”– deməmiş (onu) heç kəsə öyrətmirdilər. (Yəhudilər) ərlə arvadı bir-birindən ayıracaq işləri onlardan öyrənirdilər. Lakin onlar Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar özlərinə zərər verən, faydası olmayan şeyləri öyrənirdilər. Onlar bilirdilər ki, onu əldə edən kimsə üçün axirətdə heç bir pay yoxdur.” (Bəqərə 102)

Səkkizinci amil : Müşriklərə arxa durmaq (dəstək olmaq) və onlara müsəlmanların əleyhinə ( olmaq üçün) yardım etmək.Dəlil Allahın bu kəlamıdır:

﴿يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَتَّخِذُوا الْيَهُودَ وَالنَّصَارَى أَوْلِيَاءَ بَعْضُهُمْ أَوْلِيَاءُ بَعْضٍ وَمَنْ يَتَوَلَّهُمْ مِنْكُمْ فَإِنَّهُ مِنْهُمْ إِنَّ اللَّهَ لَا يَهْدِي الْقَوْمَ الظَّالِمِينَ﴾

“Ey iman gətirənlər! Yəhudi və xristianları (özünüzə) dost tutmayın! Onlar bir-birinin dostudurlar. Sizdən kim onlarla dostluq edərsə, o da onlardandır. Allah zalım tayfanı düz yola yönəltməz!” (Məidə 51)

Doqquzuncu amil : Kim etiqad etsə ki, bəzi insanlara Muhəmmədin– *sallalahu aleyhi vəssəlləm* – şəriətindən (dinindən) çıxmaq icazəlidir, o Allahın bu sözünə görə kafir olar :

﴿وَمَنْ يَبْتَغِ غَيْرَ الْإِسْلَامِ دِينًا فَلَنْ يُقْبَلَ مِنْهُ وَهُوَ فِي الْآخِرَةِ مِنَ الْخَاسِرِينَ﴾

“Kim İslamdan başqa bir din ardınca gedərsə, (o din) heç vaxt ondan qəbul olunmaz və o şəxs axirətdə zərər çəkənlərdən olar!” (Ali-İmran 85)

Onuncu amil : Allahın dinindən üz çevirmək, onu öyrənməmək və ona əməl etməmək.Dəlil Allahın bu ayəsidir :

﴿وَمَنْ أَظْلَمُ مِمَّنْ ذُكِّرَ بِآيَاتِ رَبِّهِ ثُمَّ أَعْرَضَ عَنْهَا إِنَّا مِنَ الْمُجْرِمِينَ مُنْتَقِمُونَ﴾

“Rəbbinin ayələri ilə öyüd-nəsihət verildikdən sonra onlardan üz döndərən kəsdən daha zalım kim ola bilər?! Şübhəsiz ki, Biz günahkarlardan intiqam alacağıq.”(Səcdə 22)

Bu lə iləhə illəllah tövhid kəliməsini pozan on amildir. Kim bunlardan birini edərsə - Allah qorusun – o İslamını pozmuş, imanını dağıtmış olar, ona dediyi Lə iləhə illəllahın da faydası olmaz.

Elm əhli bildirmişdir ki, bu İslamı pozan amilləri zarafata, ciddi və ya qorxaraq etmək arasında heç bir fərq yoxdur. Yalnız buna məcbur edilən kəs istisnadır. Bunların hamısı ən təhlükəli və ən çox baş verən amillərdir.Müsəlman gərək bu amillərdən çəkinsin və özünün bunları etməyindən qorxsun.Allahın qəzəbini cəlb etməkdən və əzablı aqibətindən Allaha sığınırıq.Allahdan təalədən bizim hamımızı onun razılığını qazanmağa müvəffəq etməsini və bizi və bütün müsəlmanları özünün doğru yoluna yönəltməsini diləyirik. Həqiqətən də O qullarına yaxın olan, onları Eşidən və Cavab verəndir.



İşarə və ya əvəzlik kimi Allahın ismini tək zikr etməyin fəsadı

Bundan qabaqkı mövzu Lə iləhə illəllahın fəzilətinin açıqlanması idi, bu kəlimə öz Rəbbini zikr edənlərin ən xeyirli zikri, dillərinin söylədiyi ən fəzilətli sözüdür.Bu kəliməni demək asan, mənası isə əzəmətlidir. Qulların ona olan ehtiyacı hər şeydən daha çoxdur, ona olan zəruriyyətləri daha çoxdur.Demək olar ki, bu kəliməyə olan ehtiyac və zəruriyyətləri onların yeməyə, içməyə, geyimə və başqa işlərinə olan zəruriyyət və ehtiyacından daha çoxdur.İnsanların və bütün aləmin hamısının mövcud zikrlərdən daha çox Lə iləhə illəllaha ehtiyaclı olduğu halda, deyilməsi ən asan, mənaca ən əzəmətli, mövqe cəhətdən ən alisi olmasına baxmayaraq görürsən ki, bəzi avam və cahillər bu kəliməni tərk edirlər. Əvəzində isə digər bidət dualara, nə Quran nə də Sünnədə olmayan, bu ümmətin sələfindən heç bir kəsdən nəql olunmayan ixtira olunmuş zikrlərə yönəlirlər.[42]

Bunlardan təsəvvüf əhlinin bəzi təriqətlərinin etdikləri zikri göstərmək olar. Onlar yalnız tək ismi zikr edirək deyirlər : Allah...Allah...Bu əzəmətli ləfzi təkrarlayırlar. Hətta eləsi də olar ki, bunun əvəzinə tək əvəzliyi təkrar-təkrar zikr edər (yəni [huva]-هو – mənası “O” şəxs əvəzliyi, “O” deməklə Allahı nəzərdə tuturlar, onlar “hu-hu..hu-hu...” deyərək bu zikri edirlər-tərc.). Bəziləri isə hədlərini aşaraq Lə iləhə illəllahı zikr etməyi avamlara, tək ismi (Allah) zikr etməyi xas insanlara, əvəzliyi (huva) isə lap xas insanlara aid edirlər. Onlardan bəziləri deyər : Lə iləhə illəllah – möminlər üçün, Allah – Ariflər ( bilikli, tanıyan) üçün, huva – isə haqqını verənlər (mühəqqiq) üçündür. Bununla da işarə ismi ilə ( huva) və ya əvəzliklə zikr etməyi Lə iləhə illəllah-dan uca tuturlar. Halbuki Allah Rasulu Lə iləhə illəllah tövhid kəliməsini ən əfzəl zikr, onun və ondan qabaqkı peyğəmbərlərin dediyi ən əfzəl söz kimi vəsf etmişdir. Biz artıq buna dəlalət edən çoxlu hədisləri bildirmişik. Bu işarə ismi və ya əvəzliklə olan zikr nə Kitabda (Quranda), nə Sünnədə əmr olunmuşdur, nədə ki ümmətin sələflərindən bir kəsdən nəql olunmuşdur. Bunu yalnız son dövrdəki zəlalət əhli və sapıqlar heç bir dəlilsiz və hüccətsiz dilə gətirmişlər.

Onların bu çağırışlarını və bidət zikrlərini Şeyxul-İslam ibn Teymiyyə*-rahiməhullah-* artıq tənqid etmişdir. Həmçinin buna kömək edib həyata keçirməyə təşəbbüs edənlərin də fəsadlarını açıqlamışdır. İbn Teymiyyə deyir : Ola bilər ki təriqətdə olan bəzi yazarlar bunun əzəmətini qeyd edərlər. Buna dəlilləri ya sevgidən, ya rəydən, ya da yalançı rəvayətlərdən gətirərlər. Onlardan bəziləri rəvayət edir ki, Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* Əli ibn Əbi Talibə*-radıyallahu anhu-* (“Allah, Allah, Allah” deməyi öyrədir, Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* bunu 3 dəfə deyir sonra isə

[42] Bax : Şeyx Abdur-Rahmən ibn Həsən Ali-Şeyx “Fəthul Məcid” (Səh.45)

Əliyə*-radıyallahu anhu-* əmr edir, o da bunu 3 dəfə deyir.) Hədis elmi əhlinin (mühəddis) ittifaqına görə bu mövdu[43] hədisdir.Peyğəmbərdən*– sallalahu aleyhi vəssəlləm –* təlqin olunan zikr, zikrin ən əzəmətlisi olan Lə iləhə illəllahdır. Bu o zikrdir ki, əmisi Əbu Talib öldüyü zaman ona bunu deməyi təlqin edirdi. Hədisdə Peyğəmbər*– sallalahu aleyhi vəssəlləm –* deyir : (Ey əmi, Lə iləhə illəllah de, Allah qatında onunla sənin xeyrinə hüccət gətirim.)[44] və demişdir :(Həqiqətən də mən elə bir kəlimə bilirəm ki, qul onu ölüm gəldiyi vaxt deyərsə ruhu ondan rahatlıq tapar)[45],digər yerdə isə : ( Kimin son sözü Lə iləhə illəllah olarsa Cənnətə daxil olar)[46], digər hədisdə: (İnsanlar Lə iləhə illəllah və Muhəmmədən Rasulullah-a şahidlik edənə kimi onlarla vuruşmaqla əmr olundum. Əgər bunu etsələr İslamın haqqı istisna məndən canlarını və mallarını qorumuş olarlar, haqq-hesabları isə Allaha aiddir)[47] Bu mənada olan hədislər çoxdur.

Sonra isə deyir : Tək ismi zikr etmək isə dində buyurulmayıb. Onun müstəhəb (sevilən) bir əməl olmasına da şəriətdə heç bir dəlil yoxdur, o ki qaldı həddi aşan tayfanın Allahın bu ayəsindəki zənninə :




“Sən: “Allah!” de, sonra da onları burax” (Ən`am 91) .Onlar belə hesab edirlər ki, burada istənilən bu ismin (Allah) deyilməsidir. Bu isə açıq-aşkar xətadır. Əgər onlar bundan əvvəl gələn sözləri düşünsələrdi ayənin nə mənaya gəldiyi onlara aydın olardı, çünki Allah təalə buyurur :

﴿وَمَا قَدَرُوا اللَّهَ حَقَّ قَدْرِهِ إِذْ قَالُوا مَا أَنْزَلَ اللَّهُ عَلَى بَشَرٍ مِنْ شَيْءٍ قُلْ مَنْ أَنْزَلَ الْكِتَابَ الَّذِي جَاءَ بِهِ مُوسَى نُورًا وَهُدًى لِلنَّاسِ تَجْعَلُونَهُ قَرَاطِيسَ تُبْدُونَهَا وَتُخْفُونَ كَثِيرًا وَعُلِّمْتُمْ مَا لَمْ تَعْلَمُوا أَنْتُمْ وَلَا آبَاؤُكُمْ قُلِ اللَّهُ ثُمَّ ذَرْهُمْ فِي خَوْضِهِمْ يَلْعَبُونَ﴾

“Onlar (yəhudilər): “Allah heç bir bəşərə bir şey nazil etməmişdir”, - deməklə Allahı layiqincə qiymətləndirmədilər. De: “Musanın insanlara bir nur və hidayət olaraq gətirdiyi kitabı (Tövratı) kim nazil etmişdir? Siz onu vərəqlərə yazıb göstərir, bir çoxunu da gizlədirsiniz. (Əslində) siz (Quran vasitəsilə) özünüzün və atalarınızın bilmədiklərini öyrənmiş olursunuz. (Ya Rəsulum!) Sən: “Allah!” de, sonra da onları burax ki, düşdükləri bataqlıqda oynaya-oynaya qalsınlar.” (Ən`am 91).Yəni de ki : Musanın gətirdiyi kitabı endirən Allahdır. Bu tam, mübtəda və

---

[43] mövdu hədis - Peyğəmbərə– sallalahu aleyhi vəssəlləm – nisbət olunan yalançı hədis növüdür-tərc.
[44] Səhih Buxari (3884), Səhih Müslim (24) Əl-Müseyyib –radiyallahu anhu – hədisindən
[45] Əhməd “Müsnəd”(1/28) ləfz də ona məxsusdur, İbn Macə (3795) Talhə - radiyallahu anhu – hədisindən
[46] Əhməd “Müsnəd”(5/247), Əbu Davud (3116) Muaz ibn Cəbəl-radiyallahu anhu – hədisindən, Albani “İrvaul-Ğəlil”də (687) həsən demişdir.
[47] Səhih Buxari (25), Səhih Müslim (22)

xəbərdən ibarət mürəkkəb ismi cümlədir. Suala dəlalət edən cavabda xəbər düşmüşdür, bu ərəblərin dilindəki ümumi qaydaya qiyas olunmuşdur...

Və Şeyxulislam*-rahiməhullah-* buna aid misallar çəkmişdir, sonra isə davamında : Şəriət dəlillərinə əsasən aydın olur ki, bu əməl heç də sevilmir – yəni : tam cümlə olmadan tək ismi zikr etmək, eləcə də əqli dəlillərə əsasən isim tək halda nə iman nə də küfr ifadə edir, eləcə də nə hidayət, nə də zəlalət, nə elm, nə də cahillik ...

(Onu da qeyd edim ki, ərəb dilini bilməyənlər dırnaq arasında olan bu sözlərin üzərində çox dayanmasın, çünki bu birbaşa qrammatik qayda olduğu üçün hər kəs başa düşməyə də bilər-tərc.)

“Daha sonra sözünə davam edərək : Buna görə ərəb dilçiləri və digər dillər üzrə olan elm əhli ittifaq etmişlər ki, ismi deyib susmaq olmaz. Bu halda o tam cümlə və faydalı kəlam sayılmaz. Buna görə də ərəblərdən bəzisi eşidəndə ki, müəzzin deyir: Əşhədu ənnə Muhəmmədən Rasuləllah (Şahidlik edirəm ki, Allahın Rəsulu Muhəmməd), həmin ərəb dedi : nə etdi ? Çünki əgər ismi təsirlik halına salsa, o zaman o sifətə çevrilər. Sifət isə ismin tamamlayıcısıdır. Bu ərəb haqlı olaraq xəbəri tələb etdi, lakin müəzzin xəbəri qəsd edərək qrammatik səhv etdi.” Əgər insan Allahın adını 1000 dəfələrlə təkrar etsə bununla mömin olmaz, nə Allahın savabına, nə də Onun Cənnətinə layiq olmaz. Bütün dinlərdən olan kafirlər Allahın adını tək isim kimi zikr edirlər, istər Onu və Onun təkliyini qəbul etsinlər,istərsə də yox. Bu ayələrə nəzər yetir :

﴿يَسْأَلُونَكَ مَاذَا أُحِلَّ لَهُمْ قُلْ أُحِلَّ لَكُمُ الطَّيِّبَاتُ وَمَا عَلَّمْتُمْ مِنَ الْجَوَارِحِ مُكَلِّبِينَ تُعَلِّمُونَهُنَّ مِمَّا عَلَّمَكُمُ اللَّهُ فَكُلُوا مِمَّا أَمْسَكْنَ عَلَيْكُمْ وَاذْكُرُوا اسْمَ اللَّهِ عَلَيْهِ وَاتَّقُوا اللَّهَ إِنَّ اللَّهَ سَرِيعُ الْحِسَابِ﴾

“Səndən onlara nəyin halal edildiyini soruşurlar. De: Təmiz nemətlər və Allahın sizə öyrətdiyindən öyrədib əhliləşdirdiyiniz yırtıcı heyvanların ovladıqları sizə halal edildi. Onların sizin üçün tutub gətirdiklərindən yeyin və (ova göndərərkən) onların üzərində Allahın adını çəkin.“ (Məidə 4) Və :

﴿ وَلَا تَأْكُلُوا مِمَّا لَمْ يُذْكَرِ اسْمُ اللَّهِ عَلَيْهِ﴾

“Üstündə Allahın adı çəkilməmiş (“bismilləh” deyilib kəsilməmiş heyvanlardan) yeməyin.” (Ən`am 121) Və :

﴿ سَبِّحِ اسْمَ رَبِّكَ الْأَعْلَى﴾

“Ən Uca olan Rəbbinin adına təriflər de!” (Ə`lə 1) Və :




"Elə isə Ulu Rəbbinin adına təriflər de!" (Vaqiə 74). Hətta bu ayələrdə bizə onun adını zikr etmək əmr olunsa da, bu tam kəlam şəklindədir, məsələn demək ki: Bismilləh (Allahın adı ilə), yaxud Subhənə Rabbiyəl Ə'lə ( Uca Rəbbim pak və müqəddəsdir), Subhənə Rabbiyəl Azim (Əzəmətli Rəbbim pak və müqəddəsdir) və s. bunun kimi dualar.Allah heç bir halda onun adını tək isim kimi zikr edilməsini əmr etmədi. Belə edərək ona itaət edilmir, belə nə ov, nə qurban, nə də başqa ibadətlər qəbul olunmaz.

İbn Teymiyyə*-rahiməhullah-* sözünə davam edərək deyir : Qeyd etdiyimiz kimi sabit olan mücərrəd ismi zikr etmək (yəni Allah...Allah demək) sevilən (müstəhəb) əməl deyil, o ki qaldı bu xas zikr olsun.Bundan daha betəri isə əvəzliyi zikr etməkdir, yəni : "huva" – o  deməkdir, bu isə özlüyündə müəyyən bir şeyə dəlalət etmir, o yalnız zikr olunan və məlum bir sözün açıqlanması ilə danışanın niyyətinə və qəsdinə bağlı olur.[48]

Digər yerdə isə Şeyxul-İslam*-rahiməhullah-* buyurmuşdur : İsmi tək əvəzlik kimi zikr etmək sünnətdən çox uzaq, bidətə və şeytanın zəlalətinə daha yaxındır...

İbn Teymiyyə*-rahiməhullah-* mövzuya davam edərək deyir : Buradakı məqsəd : Allahı zikr etməkdə qayda - onu tam cümlədə zikr etmək, ifadə şəklində bildirməkdir. Ondan biri sözlədir, qəlblərə fayda verən budur. Bununla savab  və əcr, Allaha yaxınlaşma, Onu tanıma, Onun sevgisi, qorxusu və digər ali məqsədlər və böyük tələblər qazanılır. Ancaq tək işarə ismi və ya əvəzliklə qısaltmağın isə heç bir əsli yoxdur, o ki qaladı ariflərin, xas insanların zikri olsun. Əksinə bu bidət və zəlalət növləri üçün vasitə və ateist və hüluliyyəçilərin[49] fəsadlı təsəvvürləri üçün bəhanədir...

Din iki əsl üzərindədir : Yalnız Allaha ibadət etməliyik, ona ibadəti onun qoyduğu qaydada ( onun şəriəti ilə) yerinə yetirməliyik, yəni ona bidətlə[50] ibadət etməməliyik.[51] – onun sözləri burada bitir.Burada elə təhqiq və izah vardır ki, bu məsələdə tərəddüd etməyə heç bir yer qoymur.

Həqiqətən də bu insanların Allahın dinində və şəriətində heç bir əsası olmayan bidət zikrlərə olan hərisliyi, bunun müqabilində səhih sünnəni və zikrləri tərk etmələri müsəlmanın ağlına bu sualları gətirir : Bunların Peyğəmbərin*– sallalahu aleyhi vəssəlləm –* yolundan ayrılıb onun Sünnəsindən uzaqlaşaraq Allahın haqqında heç bir

[48] "Məcmuul Fətava" (10/ 556-565)
[49] Hüluliyyə-Allahın öz yaratdıqlarında həll olduğunu (qarışdığını) iddia edən batil firqədir-tərc.
[50] Bidət-dində olmayan bir şeyi dinə əlavə etməkdir-tərc.
[51] "Məcmuul Fətava" (10/ 227-234)

dəlil endirmədiyi zikrlərə üz tutmalarına səbəb nədir ? Sonra da bununla bərabər onu hörmətlə uca tutur və onun adı ilə fəxr edirlər. Bütün məxluqatın ağası, nəbi və rəsulların ən xeyirlisi, Allaha itaətkar və zikr edən qulların öndəri olan Peyğəmbərin– *sallalahu aleyhi vəssəlləm* – dediyi dua və zikrlərin dəyər-qiymətini isə aşağı salırlar?!

Allahın salamı, xeyir-duası və bərəkəti Muhəmmədə onun ailəsinə və bütün səhabələrinin üzərinə olsun.



İrad və təkliflərinizi bu elektron poçta göndərə bilərsiniz :

azer.mustafa@yahoo.com

Mündəricat